**Бицин Л.В.** (1965) Строение и продуктивность горных лесов. М.: 128 с.

**Гигаури Г.Н.** (1980) Основы ведения хозяйства в лесах Грузии. Тбилиси, 92-96.

**Гигаури Г.Н., Джебисашвили Г.С.** (1990) Сортиментные и товарные таблицы основных лесообразующих пород горных лесов СССР. Справочник. М.: 311 с.

**Гулисашвили В.З.** (1949) О некоторых особенностьях девственных лесов бука восточного в Восточной Грузии. Труды Инст. леса АН Груз. ССР. том I, 9-14.

**Ильин А.И.** (1959) Строение буковых насаждений Северного Кавказа и отбор деревьев при постепенных и выборочных рубках. Сб. работ Северо-Кавказской ЛОС. Сочи, вып. IV, 57-67.

**Калуцкий К.К.** (1972) Буковые леса СССР и ведение хозяйства в них. М., 50-69.

**Коваль И.П.** (1969) Рост и развитие буковых лесов Кавказа. Лесн. хоз-во, 12: 21-23.

**Комин Г.Е., Семечкин И.В.** (1970) Возрастная структура древостоев и принципы ее типизации. Лесоведение **2:** 24-33.

**Науменко И.М.** (1956) Возрастная структура, строение, состояние и ход роста старовозрастных буковых насаждений центральной части Северного Кавказа. Труды Инст. леса АН Груз. ССР. том VI. Тбилиси, 41-54.

**Олисаев В.А.** (1985) Биоэкологические основы повышения комплексной продуктивности буковых лесов Северного Кавказа. автореф. дис. д-ра с-х наук. 06.03.03. Киев, 31с.

**Орлов А.Я.** (1953) Широколиственные леса Северо-Западного Кавказа. АН СССР, 269-275.

**ОСТ 56-69-83** (1983) Пробные площади лесоустроительные. Метод. закладки. М., ЦБНТИ Гослесхоза СССР: 60 с.

**Прилипко Л.И.** (1952) Лесная растительность Азербайджана. Буковые леса. Баку: АН Аз ССР: 88 с.

**Садыхов Н.А.** (1974) Исследование хода роста, строения и товарности буковых древостоев Азербайджана. автореф. дис. к-та с-х наук. 06.03.02. Минск, 26с.

**Сафаров И.С., Олисаев В.А.** (1991) Леса Кавказа: Социально-экологические функции. Владикавказ: 271с.

**Свалов С.Н.** (1985) Применение статистических методов в лесоводстве. М., ВИНИТИ: 164 с.

**Столяров Д.П., Кузнецова В.Г.** (1976) Роль возрастных поколений в строении ельников. Лесн. хоз-во **12:** 18-22.

**A.B. Yəhyayev, G.Ə. Məmmədova, Ə.Ə. Məlikov**

**Böyük Qafqazın Şimali-Şərq Yamaclarındakı Fıstıq Ağaclıqlarının Yaş Strukturu**

Məqalədə Böyük Qafqazın Şimali-şərq yamacındakı fıstıq ağaclıqlarının yaş strukturunuu öyrənilməsi üçün Qusar meşə təsərrüfatında 6 təcrübə sahəsi qoyulmuşlur. Təcrübə sahələri doluluğu 0,5-0,6 olan fıstıqlıqların üç meşə tipində yerləşdirilmişdir. Alınan nəticələr ağaclıqlardakı gövdələrin əsasən tsiklik müxtəlifyaşlılar yaş tipinə uyğun olduğu müəyyən edilmişdir. Fıstıq meşəliklərində ağacların nəsillərə bölgüsü üçün yaş hədləri təklif edilmişdir.

**A.B. Yakhyayev, G.A. Mammedova, A.A. Melikov**

**The Age Structure of North-East Slopes Beech Forest Area of Great Caucasus**

For the purpose of the study the age structure of the beech forest on north-eastern slopes of Great Caucasus, 6 experimental plots at Gusar forest agriculture were selected. On the experimental area comprising 0.5-0.6 fullness, the 3 beech forest types were located. Data obtained revealed that stems of forest were correspond, mainly, to type of cyclic age diversity. For distribution of plants in beech forest to genus the age limits were proposed.

AMEA-nın Xəbərləri (biologiya elmləri), cild 66, №3, səh. 117-123 (2011)

UOT 634.81:632.938:632.4

# Üzümün Birinci Nəsil (Fı) Hibridlərinin Mildiu (*Plasmopara Viticola Berl. et de* Toni) Xəstəliyinə Davamlılığının Dominantliq Dərəcəsinin və Heterozis Effektinin Tədqiqi

**H.M. Şıxlinski**
*AMEA Genetik Ehtiyatlar İnstitutu, Bakı AZ1106, Azadlıq prospekti 155, Azərbaycan,*

**Məqalədə mildiu xəstəliyinə davamlı (2 bal) növlərarası mürəkkəb hibridlərlə patogenə müxtəlif davamlılığı ilə fərqlənən Avrasiya növünə (*Vitis vinifera* L.) aid olan üzüm sortlarının çarpazlaşdırılmasından alınmış birinci nəsil (Fı) hibridlərinin mildiu xəstəliyinə davamlılığının dominantlıq dərəcəsi və heterozis effektinin tədqiqindən bəhs edilir.**

***Açar sözlər:*** *mildiu, dominantlıq dərəcəsi, heterozis effekti, V.vinifera L., patogen, donor*

## GİRİŞ

Mildiu xəstəliyi Azərbaycan şəraitində çox geniş yayılan, üzüm tənəklərinə hədsiz dərəcədə ziyan vuran və ən təhlükəli göbələk xəstəliklərindən biridir. Patogen yalnız bitkinin canlı toxumalarında parazitlik etməklə, obliqat xarakterli göbələklərdən biri hesab olunur. Demək olar ki, üzüm becərilən bütün bölgələrdə inkişaf edir, lakin havası quru və isti olan yerlərdə müşahidə olunmur. Mildiu (yalançı unlu şeh) xəstəliyinin törədicisi *Plasmopara viticola Berl. et de* Toni göbələyidir (Şıxlinski, 2004).

Mildiu xəstəliyinin törədicisi vegeta-siyanın bütün dövrlərində üzüm tənəklərinin yaşıl orqanlarını, o cümlədən yarpaqları, cavan zoğları, bığcıqları, çiçəkqruplarını və salxımları zədələyərək, üzüm plantasiyalarına külli miqdarda ziyan vurması ilə səciyyələnir. Adətən, əvvəlcə xəstəliklə yarpaqlar sirayətlənir, bu isə sonra tənəklərin digər yaşıl orqanlarının sirayətlənməsi üçün ikinci yoluxma (infeksiya) mənbəyi vəzifəsini yerinə yetirir (Войтович, 1981; Şıxlinski, 2004).

Növlərarası mürəkkəb hibridlərlə *V.vinifera* L. və *V.amurensis* Rupr. növlərinə mənsub müxtəlif davamlılığı ilə fərqlənən üzüm sortları arasında çarpazlaşdırılma aparılaraq, birinci nəsil (Fı) hibridlərində göbələk xəstəliklərinə və fillokseraya davamlılıq əlamətlərinin irsən keçməsinin qanunauyğunluqları tədqiq edilmişdir. Müəlliflər, tərəfindən müəyyən edilmişdir ki, birinci nəsil (Fı) hibridlərində çox böyük immunoloji heterogenlik meydana çıxır (Гузун, 1978; Гуменюк, 1979; Недов и Агапова, 1989; Şıxlinski, 2006, 2007, 2008).

Mildiu və oidiuma davamlılıq əlamətlərinin öyrənilməsi məqsədilə Avropa-Amerika və Avropa-Amur üzüm növləri arasında çarpazlaşdırılma aparılaraq, alınmış hibridlərdə mildiu və oidiuma davamlılıq əlamətlərinin monogen kontrol olunduğu müəyyən edilmiş və həmin əlamətlərin bir-birindən və eyni zamanda digər əlamətlərdən də asılı olmadığı aşkar edilmişdir (Филиппенко и Штин, 1978; Штин, 1987, 2005; Штин и Филиппенко, 2008).

Mildiu xəstəliyinə davamlı növlərarası mürəkkəb hibridlərlə patogenə müxtəlif davamlılığı ilə fərqlənən Avrasiya növünə (*V.vinifera* L.) aid üzüm sortlarının çarpazlaşdırılması nəticəsində alınmış birinci nəsil (Fı) hibridlərinin dominantlıq dərəcəsi tədqiq edilmişdir. Çarpazlaşdırılma kombinasiyalarından asılı olaraq, birinci nəsil (Fı) hibridlərində mildiuya davamlılıq tam, natamam (aralıq) və mənfi dominantlıq dərəcəsi aşkar edilmişdir. Müəlliflər, eyni zamanda üzümün birinci nəsil hibridlərinin heterozis effektini tədqiq edərək, müəyyənləşdirmişlər ki, patogenə davamlılıq əsasən valideyn cütlərinin genotipindən daha çox asılıdır (Əkbərov və b., 2006, 2006; Səlimov, 2007; Şıxlinski, 2006, 2008).

Alınmış hibridlərin analizi göstərir ki, filloksera, patogen mikroflora, mildiu, oidium, boz çürüməyə kompleksdavamlı, yüksək məhsuldarlıq və yaxşı keyfiyyətli məhsula malik polifaktor əlamətlərin bir genotipdə toplanılması mümkündür (Усатов, 1988; Штин, 2005).

Mildiu və oidium xəstəliklərinə davamlı üzüm sortlarının yaradılması məqsədi ilə *V.vinifera* L. və *V.amurensis* Rupr. növləri arasında çarpazlaşdırılma aparılaraq, seleksiya praktikasında ilk dəfə olaraq mildiuya davamlılıq Pv (a) geninin *V.amurensis* Rupr. növündən, oidiuma davamlılıq Un (v) geninin isə *V.vinifera* L. növünə mənsub üzüm sortlarından nəslə keçdiyi müəyyən edilmişdir (Штин, 2005; Штин и Филиппенко, 2008).

## MATERİAL VƏ METODLAR

Azərbaycanda üzüm sort və formalarının mildiu xəstəliyinə davamlılığının öyrənilməsi məqsədilə müxtəlif ekoloji-coğrafi şəraitdə

E-mail: sh.haci@yahoo.com

(Qarabağ Elmi-Tədqiqat Bazasında, Tovuz Dayaq Məntəqəsində, Abşeron Elmi-Tədqiqat Bazasında), təbii fonda 700-dən artıq üzüm sort və formalarının patogenlə sirayətlənməsinin təbii fonda fitopatoloji qiymətləndirilməsi aparılmışdır (Şıxlinski, 2006; Шихлинский, 2006, 2009, 2009, 2009, 2009; Шихлинский и др., 2008, 2009).

Aparılan fitopatoloji qiymətləndirilmə nəticəsində davamlı və tolerant reaksiya göstərən 14 hibrid üzüm forması seçilərək, onların həm dominantlıq dərəcəsi, həm də heterozis effekti tədqiq edilmişdir.

Birinci nəsil (Fı) hibridlərində mildiu xəstəliyinə davamlılığın dominantlıq dərəcə-sinin və heterozis effektinin tədqiqi məqsədilə davamlı (2 bal) növlərarası mürəkkəb hibridlərlə patogenə müxtəlif davamlılığı ilə fərqlənən Avropa-Asiya (*V.vinifera* L.) növünə mənsub üzüm sortları arasında aşağıdakı kombinasiyalar üzrə çarpazlaşdırılma aparılmışdır:

Zeybel 13-666 x Aleatiko;
SV 18-315 x İrşai Oliver;
SV 12-375 x Traminer ;
SV 18-315 x Aliqote;
Zeybel 13-666 x Turiqa;
Zeybel 13-666 x Muskat fioletovıy;
Zeybel 13-666 x Qreçeskiy rozovıy;
Aleatiko xZeybel 13-666;
Kaberne x SV 18-315;
Muskat belıy x SV 12-375.

Birinci nəsil (Fı) hibridlərinin mildiu xəstəliyinə davamlılığının təbii fonda fitopatoloji qiymətləndirilməsi zamanı 5 ballı şkaladan istifadə edilmişdir (Войтович, 1981, 1987; Недов, 1985). Təbii fonda seçilmiş birinci nəsil (Fı) hibridlərinin həm dominantlıq dərəcəsinin, həm də heterozis effektinin göstəriciləri məlum formula ilə tədqiq edilmişdir (Абрамова, 1992).

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Cədvəl 1-dən göründüyü kimi, mildiu xəstəliyinə davamlı (2 bal) komponentlərə malik ana formalarla (Zeybel 13-666, SV 18-315, SV 12-275) davamsız (4 bal) komponentlərə malik ata valideyn formaların (Aleatiko, İrşai Oliver, Traminer, Aliqote) çarpazlaşdırılması nəticəsində alınmış birinci nəsil (Fı) hibridlərində dominantlıq dərəcəsi müsbət olmuş və davamlı ana (2 bal) valideyn formaya yaxınlaşdığı təyin edilmişdir. Dominantlıq dərəcəsi davamlı (2 bal) valideyn formaya yaxınlaşan formalar bu çarpazlaş-dırılmadan alınmış hibridlər (Zeybel 13-666 x Aleatiko və SV 12-375 x Traminer) olduğu müəyyən edilmişdir. Hibridlərdə müsbət dominantlıq dərəcəsi d=1,95 ilə (Zeybel 13-666 x Aleatiko) d=1,46 (SV 18-315 x İrşai Oliver) arasında tərəddüd etdiyi müəyyən edilmişdir (Cədvəl 1).

Davamlı (2 bal) komponentlərə malik ana formalarla çoxdavamsız (5 bal) komponentlərə malik ata formaların çarpaz-laşdırılması nəticəsində alınmış birinci nəsil (Fı) hibridlərində də müsbət dominantlıq dərəcəsi müşahidə olunmuşdur. Müsbət dominantlıq dərəcəsi d=1,28 ilə (Zeybel 13-666 x Turiqa) d=1,25 (Zeybel 13-666 x Muskat fioletovıy) arasında tərəddüd etdiyi təyin edilmişdir.

Davamlı (2 bal) komponentlərə malik olan ana formalarla tolerant (3 bal) komponentlərə malik ata formaların çarpazlaş-dırılması nəticəsində alınmış birinci nəsil (Fı) hibriddə dominantlıq dərəcəsi mənfi olduğu müəyyən edilmişdir. Mənfi dominantlıq dərəcəsi d=-2,08-ə (Zeybel 13-666 x Qreçeskiy rozovıy) bərabər olması aşkar edilmişdir.

Davamsız (4 bal) komponentlərə malik olan ana formalarla davamlı (2 bal) komponentlərə malik ata formaların çarpazlaş-dırılması nəticəsində alınmış birinci nəsil (Fı) hibridlərində mənfi dominantlıq dərəcəsi meydana çıxmışdır. Mənfi dominantlıq dərəcəsi d=-0,5 ilə (Aleatiko x Zeybel 13-666) d=-1,2 (Kaberne x SV 18-315) arasında tərəddüd etdiyi müəyyən edilmişdir.

Çoxdavamsız (5 bal) komponentlərə malik olan ana formalarla davamlı (2 bal) komponentlərə malik ata formaların çarpazlaşdırılması nəticəsində alınmış birinci nəsil (Fı) hibriddə dominantlıq dərəcəsi müsbət olmuşdur. Müsbət dominantlıq dərəcəsi d=0,11-ə (Muskat belıy x SV 12-375) bərabər olması aşkar edilmişdir.

Mildiu xəstəliyinə davamlı (2 bal) növlərarası mürəkkəb hibridlərlə (Zeybel 13-666, SV 18-315, SV 12-375, yəni bu növlərarası mürəkkəb hibridlərdən çarpazlaş-dırılmalarda həm ana, həm də ata valideyn cütü kimi istifadə olunmuşdur) patogenə müxtəlif davamlılığı ilə fərqlənən Avropa-Asiya növünə aid üzüm sortları arasında aparılan çarpazlaş-dırılma nəticəsində alınmış birinci nəsil (Fı) hibridləri içərisində dominantlıq dərəcələri həm müsbət, həm də mənfi istiqamətə doğru meyl etdiyi təyin edilmişdir.

Cədvəl 2-dən göründüyü kimi, mildiu xəstəliyinə davamlı (2 bal) komponentlərə malik ana formalarla patogenə davamsız (4 bal) komponentlərə malik ata formaların çarpazlaşdırılması nəticəsində alınmış birinci nəsil (Fı) hibridlərinin hamısında mənfi heterozis effekti meydana çıxdığı müəyyən edilmişdir. SV 18-315 x İrşai Oliver kombinasiyasından alınmış Univers (III-49-6) hibridində mənfi heterozis effekti G=-48,7% ilə Zeybel 13-666 x Aleatiko kombinasiyasından alınmış Qaliya (XI-36-47) hibridində mənfi heterozis effekti G=-65% arasında tərəddüd etdiyi araşdırmalar zamanı müəyyən edilmişdir (Cədvəl 2).

**Cədvəl 1.** Birinci nəsil (Fı) hibridlərinin mildiu xəstəliyinə davamlılığının dominantlıq dərəcəsinin göstəriciləri

| Kombinasiyalar | Orta davamlılıq, balla | | | Dominantlıq dərəcəsi, d |
|---|---|---|---|---|
| | ana | ata | $F_1$ | |
| D a v a m l ı (2 bal) x d a v a m s ı z (4 bal) | | | | |
| Zeybel 13-666 x Aleatiko Qaliya (XI-36-47) | 2 | 4 | 1,05 | 1,95 |
| Zeybel 13-666 x Aleatiko (XI-37-13) | 2 | 4 | 1,33 | 1,67 |
| Zeybel 13-666 x Aleatiko Flakera (XI-37-38) | 2 | 4 | 1,17 | 1,83 |
| SV 18-315 x İrşai Oliver Univers (III-49-6) | 2 | 4 | 1,54 | 1,46 |
| SV 12-375 x Traminer Venus (V-102-47) | 2 | 4 | 1,27 | 1,73 |
| `SV 18-315 x Aleatiko (III-64-I) | 2 | 4 | 1,43 | 1,57 |
| SV 18-315 x Aliqote (III-70-73) | 2 | 4 | 1,38 | 1,62 |
| SV 12-375 x Traminer Luçaferul (XIV-I-64) | 2 | 4 | 1,14 | 1,86 |
| D a v a m l ı (2 bal) x çoxdavamsız (5 bal) | | | | |
| Zeybel 13-666 x Turiqa (III-51-64) | 2 | 5 | 1,58 | 1,28 |
| Zeybel 13-666 x Muskat fioletovıy (XI-36-78) | 2 | 5 | 1,62 | 1,25 |
| D a v a m l ı (2 bal) x t o l e r a n t (3 bal) | | | | |
| Zeybel 13-666 x Qreçeskiy rozovıy Daçiya (XI-38-92) | 2 | 3 | 3,54 | -2,08 |
| D a v a m s ı z (4 bal) x d a v a m l ı (2 bal) | | | | |
| Aleatiko x Zeybel 13-666 Bessarabskiy çernıy (XI-37-52) | 4 | 2 | 3,5 | -0,5 |
| Kaberne x SV 18-315 Prut (XV-50-12) | 4 | 2 | 4,2 | -1,2 |
| Ç o x d a v a m s ı z (5 bal) x d a v a m l ı (2 bal) | | | | |
| Muskat belıy x SV 12-375 (XIV-3-90) | 5 | 2 | 3,34 | 0,11 |

Patogenə davamlı (2 bal) komponentlərə malik olan ana formalarla mildiu xəstəliyinə çoxdavamsız (5 bal) komponentlərə malik ata formaların çarpazlaşdırılması nəticəsində alınmış birinci nəsil (Fı) hibridlərinin də hamısında mənfi heterozis effekti meydana çıxmışdır. Zeybel 13-666 x Turiqa kombinasiyasından alınmış (III-51-64) hibridində mənfi heterozis effekti G=-54,9% ilə Zeybel 13-666 x Muskat fioletovıy kombinasiyasından alınmış (XI-36-78) hibridində mənfi heterozis effekti G=-53,7% olması aparılan araşdırmalar nəticəsində müəyyən edilmişdir.

Mildiu xəstəliyinə davamlı (2 bal) komponentlərə malik ana formalarla patogenə tolerant (3 bal) komponentlərə malik ata formaların çarpazlaşdırılması nəticəsində alınmış birinci nəsil (Fı) hibridlərində müsbət heterozis effekti meydana çıxmışdır. Zeybel 13-666 x Qreçeskiy rozovıy kombinasiyasından alınmış Daçiya (XI-38-92) hibridində müsbət heterozis effekti G=41,6% olduğu aşkar edilmişdir. Aparılan araşdırmalar nəticəsində bu kombinasiyadan alınmış hibriddə patogenə davamlılığın valideyn formalardan nisbətən yüksək olduğu müəyyən edilmişdir.

Patogenə davamsız (4 bal) komponentlərə malik ana formalarla xəstəliyə davamlı (2 bal) komponentlərə malik ata formaların çarpazlaşdırılması nəticəsində alınmış birinci nəsil (Fı) hibridlərində müsbət heterozis effekti meydana çıxması müəyyən edilmişdir. Aleatiko x Zeybel 13-666 kombina-siyasından alınmış Bessarabskiy çernıy (XI-37-52) hibridində müsbət heterozis effekti G=16,67% olduğu halda, digər bir kombinasiyadan Kaberne x SV 18-315 alınmış Prut (XV-50-12) hibridində isə heterozis effekti G=40%-ə bərabər olduğu aşkar edilmişdir. Aparılan araşdırmalar zamanı bu kombina-siyadan alınmış hibridlərdə mildiu xəstəliyinə davamlılığın valideyn cütlərinə nisbətən yüksək olması təyin edilmişdir.

**Cədvəl 2.** Birinci nəsil (Fı) hibridlərinin mildiu xəstəliyinə davamlılığının heterozis effektinin göstəriciləri

| Kombinasiyalar | Orta davamlılıq, balla | | Heterozis G, %-lə |
|---|---|---|---|
| | M F | Fı | |
| Davamlı (2 bal) x davamsız (4 bal) | | | |
| Zeybel 13-666 x Aleatiko Qaliya (XI-36-47) | 3 | 1,05 | -65 |
| Zeybel 13-666 x Aleatiko (XI-37-13) | 3 | 1,33 | -55,7 |
| Zeybel 13-666 x Aleatiko Flakera (XI-37-38) | 3 | 1,17 | -61 |
| SV 18-315 x İrşai Oliver Univers (III-49-6) | 3 | 1,54 | -48,7 |
| SV 12-375 x Traminer Venus (V-102-47) | 3 | 1,27 | -57,7 |
| SV 18-315 x Aleatiko (III-64-1) | 3 | 1,43 | -52,3 |
| SV 18-315 x Aliqote (III-70-73) | 3 | 1,38 | -54 |
| SV 12-375 x Traminer Luçaferul (XIV-1-64) | 3 | 1,14 | -62 |
| Davamlı (2 bal) x çoxdavamsız (5 bal) | | | |
| Zeybel 13-666 x Turiqa (III-51-64) | 3,5 | 1,58 | -54,9 |
| Zeybel 13-666 x Muskat fioletovıy (XI-36-78) | 3,5 | 1,62 | -53,7 |
| Davamlı (2 bal) x tolerant (3 bal) | | | |
| Zeybel 13-666 x Qreçeskiy rozovıy Daçiya (XI-38-92) | 2,5 | 3,54 | 41,6 |
| Davamsız (4 bal) x davamlı (2 bal) | | | |
| Aleatiko x Zeybel 13-666 Bessarabskiy çernıy (XI-37-52) | 3 | 3,5 | 16,67 |
| Kaberne x SV 18-315 Prut (XV-50-12) | 3 | 4,2 | 40 |
| Çoxdavamsız (5 bal) x davamlı (2 bal) | | | |
| Muskat belıy x SV 12-375 (XIV-3-90) | 3,5 | 3,34 | -4,57 |

Mildiu xəstəliyinə çoxdavamsız (5 bal) komponentlərə malik ana formalarla patogenə davamlı (2 bal) komponentlərə malik olan ata formaların çarpazlaşdırılması (Muskat belıy x SV 12-375) nəticəsində alınmış birinci nəsil (Fı) hibridində (XIV-3-90) mənfi heterozis effekti G=-4,57% meydana çıxdığı müəyyən edilmişdir. Mənfi heterozis effekti aşağı olduğuna görə bir o qədər əhəmiyyət kəsb etmir, ona görə də hibridin patogenə davamlılığı valideyn formalarına yaxınlaşır.

Aparılan tədqiqat nəticəsində müxtəlif tip kombinasiyaların çarpazlaşdırılması zamanı alınmış birinci nəsil (Fı) hibridləri içərisində mənfi heterozis effektinə malik hibridlərlə yanaşı, eyni zamanda müsbət heterozis effektinə malik hibridlərin meydana çıxması da müəyyən edilmişdir.

Araşdırmalar nəticəsində müəyyən edilmişdir ki, bu və ya digər genetik keyfiyyətlər kimi, birinci nəsil (Fı) hibridlərinin mildiu xəstəliyinə davamlılığı çarpazlaşdırılma kombinasiyalarının tiplərindən və valideyn cütlərinin seçilməsindən daha çox asılıdır.

Tədqiqat zamanı Zeybel 13-666 x Aleatiko kombinasiyasından alınmış Qaliya (XI-36-47) hibridində ən yüksək mənfi heterozis effekti G=-65% müşahidə olunduğu halda, Muskat belıy x SV 12-375 kombinasiyasından alınmış (XIV- 3-90) hibridində isə ən aşağı mənfi heterozis effekti G=-4,57% meydana çıxması aşkar edilmişdir.

Araşdırmalar zamanı Zeybel 13-666 x Qreçeskiy rozovıy kombinasiyasından alınmış Daçiya (XI-38-92) hibridində ən yüksək müsbət heterozis effekti G=41,6% müşahidə olunduğu halda, Aleatiko x Zeybel 13-666 kombinasiyasından alınmış Bessarabskiy çernıy (XI-37-52) hibridində isə ən aşağı müsbət heterozis effekti G=16,67% meydana çıxması müəyyən edilmişdir.

Aparılan tədqiqat nəticəsində müəyyən edilmişdir ki, davamlı (2 bal) komponentlərə malik ana formalarla həm davamsız (4 bal), həm də çoxdavamsız (5 bal) komponentlərə malik ata formaların çarpazlaşdırılması nəticəsində alınmış

birinci nəsil (F₁) hibridlərində də müsbət dominantlıq dərəcəsi meydana çıxa bilər.

Birinci nəsil (F₁) hibridlərinin mildiu xəstəliyinə davamlılığının dominantlıq dərəcəsinin tədqiqi işlərinin nəticələri göstərir ki, dominantlıq dərəcəsinin müsbət və yaxud mənfi olması çarpazlaşdırılma kombinasiya-larından və valideyn cütlərinin seçilməsindən daha çox asılı olduğu aparılan tədqiqat nəticəsində müəyyən edilmişdir.

Mildiu xəstəliyinə davamlı növlərarası mürəkkəb hibridlərlə (SV 12-375 və SV 18-315) patogenə müxtəlif davamlılığı ilə fərqlənən Avrasiya növünə mənsub üzüm sortlarının çarpazlaşdırılması nəticəsində alınmış birinci nəsil (F₁) hibridlərinin mildiuya davamlılığının heterozis effekti tədqiq edilmiş, müxtəlif tip kombinasiyaların çarpazlaşdı-rılması nəticəsində alınmış hibridlərdə müsbət və mənfi, həmçinin heterozis effekti müşahidə olunmayan üzüm formalarının alındığı da müəyyən edilmişdir.

Aparılan tədqiqat zamanı müxtəlif tip kombinasiyaların çarpazlaşdırılması nəticəsində alınmış birinci nəsil (F₁) hibrid formalarında həm dominantlıq dərəcəsinin, həm də heterozis effektinin çox böyük hüdüd daxilində variasiya etdiyi müəyyən edilmişdir. Bunun səbəbini isə üzüm bitkisinin böyük genetik heterogenliyə malik olmasından, valideyn cütlərinin genotiplərindən, çarpazlaşma kombinasiyalarından və davamlılıq əlamətinin isə poligen xarakterliyi ilə izah etmək olar.

Müxtəlif tip kombinasiyaların çarpaz-laşdırılmasından istifadə etməklə mildiu xəstəliyinə həm davamlı, həm də tolerant reaksiya göstərən birinci nəsil (F₁) hibridlərində heterozis effekti yüksək olan hibrid üzüm formalarının alınması mümkündür və bu zaman isə patogenə davamlı (2 bal) növlərarası mürəkkəb hibridlərdən yararlanmaq məqsədə uyğundur.

Patogenə davamlı və tolerant yüksəkkeyfiyyətli yeni üzüm formalarının alınmasında növlərarası mürəkkəb hibridlərdən (SV 12-375; Zeybel 13-666; SV 18-315) seleksiya proqramlarında başlanğıc davamlılıq donor materialı kimi istifadə olunması da məqsədə müvafiqdir.

Yüksəkkeyfiyyətli və kompleksdavamlı yeni üzüm sortlarının yaradılmasını sürətləndirmək məqsədi ilə davamlı Amerika üzüm növlərinin hibridlərindən istifadə olunması məsləhət görülür. Növlərarası çarpazlaşdırılma zamanı heteroziqotluğun artması nəticəsində kompleks davamlı və yüksək keyfiyyətli məhsula malik üzüm sortlarının yaradılması mümkündür.

Aparılan tədqiqat nəticəsində müəyyən edilmişdir ki, kök filloklerasına, kökçürüdücü mikroorqanizmlərə (göbələk və bakteriyalar) və göbələk xəstəliktörədicilərinə (mildiu, oidium, boz çürümə, antraknoz) poligen davamlılıq əlamətlərinin bir genotipdə toplanılması mümkündür və bunun da nəticəsində kompleksdavamlı üzüm sort və formalarının yaradılması həyata keçirilə bilər.

Yuxarıda deyilənləri nəzərə alaraq, patogenə davamlı növlərarası mürəkkəb hibridlərlə mildiuya müxtəlif davamlılığı ilə fərqlənən Avropa-Asiya (*V.vinifera* L.) növünə mənsub üzüm sortlarının çarpazlaşdırıl-masından yüksəkkeyfiyyətli və kompleks-davamlı üzüm sort və formalarının yaradılması mümkündür və vacibdir. Yaradılmış yeni üzüm sort və formalarından xəstəliklərin geniş yayıldığı bölgələrdə zəhərli kimyəvi preparatlardan istifadə olunmadan və filloksera ilə tam sirayətlənmiş təsərrüfatlarda öz kökü üzərində becərilməsi məqsədəuyğun hesab edilə bilər.

## ƏDƏBİYYAT

**Əkbərov A.İ., Şıxlinski H.M., Məcidli İ.Q.** (2006) Milduya davamlılığın dominantlığının tədqiqi. Azərbaycan Aqrar Elmi. Bakı, **1-2:** 118-120.

**Əkbərov A.İ., Şıxlinski H.M., Səlimov V.S.** (2006) Növlərarası mürəkkəb hibridlərdə mildiuya davamlılığın heterozisi. AzETÜŞİ-nin elmi əsərlərinin tematik məcmuəsi. Bakı, Müəllim: **XVIII**, 118-124.

**Səlimov V.S.** (2007) Heterozis və ondan üzümün seleksiyasında istifadə. Azərbaycan Aqrar Elmi. Bakı, **6-7:** 40-44.

**Şıxlinski H.M.** (2004) Üzümün xəstəlikləri, zərərvericiləri və onlarla mübarizə. Bakı, Azərnəşr: 134 s.

**Şıxlinski H.M.** (2006) Kolleksiya sortlarının və seleksiya üzüm formalarının əsas göbələk xəstəliklərinə davamlılıqlarının qiymətləndirilməsi. AMEA-nın xəbərləri (biologiya elmləri seriyası) Bakı, Elm: **5-6:** 158-165.

**Şıxlinski H.M.** (2006) Təbii fonda üzüm sort və formalarının əsas göbələk xəstəliklərinə qarşı fitopatoloji qiymətləndirilməsi. Kimya, biologiya, tibb. Bilgi dərgisi. Bakı, Təhsil: **1-2:** 29-32.

**Şıxlinski H.M.** (2007) Kompleks süni yoluxma fonunda üzüm sort və formalarının filloksera və göbələk xəstəlikləri ilə sirayətlənmələrinin tədqiqi. AMEA-nın xəbərləri (biologiya elmləri seriyası) Bakı, Elm: **5-6:** 92-99.

**Şıxlinski H.M.** (2008) Üzümün birinci nəsil (F₁) hibridlərinin mildiu xəstəliyinə davamlılığının dominantlıq dərəcəsinin tədqiqi. Azərbaycan Aqrar Elmi. Bakı, **4-5:** 105-106.

**Абрамова З.В.** (1992) Практикум по генетике. М., Агропромиздат: 224 с.

**Войтович К.А.** (1981) Новые комплексно-устойчивые сорта винограда. Кишинев, Картя

Молдовеняскэ: 198 с.

**Войтович К.А.** (1987) Новые комплексно-устойчивые столовые сорта винограда. Кишинев, Картя Молдовеняскэ: 226 с.

**Гузун Н.И.** (1978) Селекция винограда на комплексную устойчивость. Генетика и селекция винограда на иммунитет. Киев, Наукова Думка: 45-51.

**Гуменюк Л.Г.** (1979) Гибридологический анализ гибридных сеянцев винограда Fı по устойчивости и качеству. Защита винограда и плодовых культур от вредителей и болезней. Кишинев, Картя Молдовеняскэ: 71-83.

**Недов П.Н.** (1985) Новые методы фитопатологических и иммунологических исследований в виноградарстве. Кишинев, Штиинца: 138 с.

**Недов П.Н., Агапова С.И.** (1989) Закономерности наследования признаков устойчивости винограда к грибным болезням, филлоксере и морозу. Садоводство и виноградарство Молдавии. **11:** 34-37.

**Усатов В.Т.** (1988) Некоторые итогии использования комплексного инфекцион-ного фона в иммуноселекции винограда. Перспективы генетики и селекции винограда на иммунитет. Киев, Наукова Думка: 156-162.

**Филиппенко И.М., Штин Л.Т.** (1978) Генетические основы селекции винограда на устойчивость к милдью и оидиуму. Генетика и селекция винограда на иммунитет. Киев, Наукова Думка: 81-88.

**Шихлинский Г.М.** (2006) Оценка устойчивости сортов и форм винограда к основным грибным болезням в условиях Азербайджана. Материалы XV Международного симпозиума. Нетрадиционное растениеводство. Эниология. Экология и здоровье. 3-й сьезд селекционеров. Симферополь, 475-476.

**Шихлинский Г.М.** (2009) Изучение устойчивости интродуцированных гибридов винограда к филлоксере и грибным болезням в условиях Азербайджана. Материалы Международной конференции. Интродукция растений: теоретические, методические и прикладные проблемы. Йошкар-Ола, 113-115.

**Шихлинский Г.М.** (2009) Оценка устойчивости районированных сортов и новых селекционных форм винограда к филлоксере и основным грибным болезням в условиях Азербайджана. Вестник Кыргызского аграрного университета. Бишкек, **4(15):** 68-71.

**Шихлинский Г.М.** (2009) Оценка устойчивости сортов и форм винограда к основным грибным болезням в различных эколого-географических зонах Азербайджана. Сборник тезисов Международной научной конференции. Чарльз Дарвин и современная биология. Теория эволюции: между наукой и идеологией. Санкт-Петербург. 78-80.

**Шихлинский Г.М.** (2009) Сохранение сортов винограда в различных эколого-географических регионах Азербайджана в условиях Ex situ и их иммунологическая характеристика. Материалы Всероссийской конференции «Проблема и стратегия сохранения биоразнообразия растительного мира Северной Азии». Новосибирск, 276-277.

**Шихлинский Г.М.** (2009) Устойчивость районированных сортов и новых селекционных форм винограда к филлоксере и грибным болезням в условиях Азербайджана. Сообщение Академии сельскохозяйственных наук Грузии. Тбилиси, **25**: 132-136.

**Шихлинский Г.М., Акперов А.И., Хияви К.Г**. (2008) Оценка и подбор исходного материала для изучения наследования признаков устойчивости к милдью. Сборник научных трудов Национальной Академии Наук Украины. Факторы экспериментальной эволюции организмов. Киев, Логос: **5,** 226-230.

**Шихлинский Г.М., Хияви К.Г., Акрами М., Ирани Г.** (2009) Устойчивость коллекционных сортов и селекционных форм винограда к основным грибным болезням в условиях Азербайджана. Материалы VIII Международного симпозиума. Новые и нетрадиционные растения и перспективы их использования. Москва, Российский университет дружбы народов: **2:** 346-348.

**Штин Л.Т.** (1987) Создание доноров устойчивости к милдью и оидиуму для селекции интенсивных сортов винограда. Генетические основы селекции на иммунитет плодовых, ягодных культур и винограда. Мичуринск, 79-87.

**Штин Л.Т.** (2005) Новые сорта винограда устойчивые к грибным патогенам милдью и оидиуму. Материалы XIV Международного симпозиума "Нетрадиционное растениеводство. Эниология. Экология и здоровье". 2-ой съезд селекционеров. Симферополь, 381-382.

**Штин Л.Т., Филиппенко Л.И.** (2008) Селекция сортов винограда устойчивых к грибным патогенам - милдью и оидиуму. VIII Международная научно-методическая конференция"Интродукция нетрадиционных и редких растений". Воронеж, Кварта: **1:** 85-86.

**Шихлинский Г.М.**

**Исследование Степени Доминирования Милдьюустойчивости (*Plasmopara Viticola Berl. et de* Toni) и Гетерозисного Эффекта Гибридов Винограда Первого Поколения (F₁)**

В статье представлены данные степени доминирования милдьюустойчивости и гетерозисного эффекта гибридов винограда первого поколения ($F_1$), полученные в результате скрещивания устойчивых к патогену (2 балла) сложных межвидовых гибридов (SV 18-315, Zeybel 13-666, SV 12-375) с Евроазиатскими (*V.vinifera* L.) сортами винограда, отличающимися различной устойчивостью к милдью.

**Shikhlinski H.M.**

**Investigation of Domination Degree of Mildew Resistance (*Plasmopara Viticola Berl. et de* Toni) and Heterosis Effect of the First Generation ($F_1$) Hybrids of Grape**

This article deals with studying of domination degree of mildew resistance and heterosis effect of the first generation ($F_1$) hybrids formed of crossing of pathogen resistant (2 points) complex hybrids (SV 18-315, Zeybel 13-666, SV 12-375) with mildew resistant European-Asian (*V.vinifera* L.) grape varieties.

AMEA-nın Xəbərləri (biologiya elmləri), cild 66, №3, səh. 124-127 (2011)

# К Фитохимическому Изучению Облепихи (*Hippophae rhamnoides* L.) Флоры Азербайджана

**И.М. Багиров***
*Азербайджанский Медицинский Университет*
*e-mail:huseyn30@yahoo.com*

**В статье приведено фитохимическое изучение облепихи крушиновидной, произрастающей в Азербайджане. Проведенные исследования позволили выявить некоторые фармакогностические свойства, которые могут быть использованы для получения фармацевтических препаратов.**

## ВВЕДЕНИЕ

Несмотря на большие успехи в области создания синтетических лекарственных средств, в настоящее время большое внимание уделяется разработке и внедрению в практику здравоохранения эффективных и малотоксичных лекарственных средств на основе лекарственного растительного сырья. В связи с вышеизложенным, проблема изыскания природных сырьевых источников биологически активных веществ, эффективных для лечения различных заболеваний, является весьма важной и нуждается в решении.

Облепиха крушиновидная, произрастающия в Азербайджане, является перспективным источником получения витаминных препаратов (Флора Азербайджана, 1955; Насудари, 1988, Новрузов, 2010, 2011; Novruzov and Shamsizade, 2005).

Целью настоящей работы является фитохимическое изучение облепихи крушиновидной флоры Азербайджана.

## МАТЕРИАЛЫ И МЕТОДЫ

Объектом исследования служили листья и созревшие плоды дикорастущей облепихи, произрастающей в различных районах Азербайджана, и новые гибридные сорта облепихи “Зафарани” и “Шафа”, созданные сотрудниками института генетики и селекции АН Азербайджанской Республики, академиком И.Д. Мустафаевым и зав. лаборатории генофонда к.б.н. Г.Имамалиевым, заготовленные в 1991-2005 годах.

Изучение внешних признаков и микроскопии плодов и листьев облепихи крушиновидной осуществлялось в соответствии с требованиями ГФ XI издания, т.1, стр. 277. Препараты изучали под микроскопом МБИ-3 (увеличения 7x1,5x10; 7x1,5x20; 15x1,5x10;15x1,5x20). Результаты документировали микрофотографиями с помощью фотоаппарата «Canon» и микрофотонасадки МФН-12.

Содержание флавоноидного состава собранных материалов проверяли цианидиновой реакцией и методом бумажной хроматографии. При проведении бумажной хроматографии (БХ) использовали бумагу марки «Filtrak F» № 17. Хроматографирование проводили восходящим, нисходящим, одномерным и двумерным способами при комнатной температуре (17-22°С), используя системы растворителей: 15% раствор уксусной кислоты, н-бутанол-уксусная кислота-вода (5:1:4).

Для выявления пятен флавоноидов на хроматограмме, в качестве проявителя использовали 10% водно-метанольный раствор щелочи, насыщенный (2%) метанольный раствор азотокислого цирконила и пары аммиака.

Окраску пятен флавоноидов наблюдали в видимом УФ-свете до и после проявления.

Для выделения флавоноидов пользовались избирательной экстракцией, колоночной хроматографией на полиамидном сорбенте.

Выделенные флавоноиды после перекристаллизации из соответствующих растворителей и высушивания подвергали анализу. Температуру плавления выделенных флавоноидных соединений определяли на блоке Кофлера.

При анализе флавоноидных гликозидов применяли методы кислотного ферментативного гидролиза. При проведении гидролиза использовали 1, 3, 5, 10%-ные растворы серной кислоты, фермент эмульсин, рамнодиастазу и препарат гриба *Aspergyllus oryzae*.

После гидролиза флавоноидных гликозидов, пятна сахаров на бумажной хроматограмме обнаруживали анилинфталатом реагентом.

Идентификацию выделенных флавоноидных соединений из изучаемых объектов осуществляли в сравнении также с известными стандартными образцами методом бумажной хроматографии.

Количественное содержание облепихового масла в собранных из различных районов Азербайджана плодах определяли весовым методом,

*E-mail: huseyn30@yahoo.com

после экстракции сырья хлороформом.

Определение показателей жирного масла проводили в соответствии с общей фармакопейной статьей 472 «Масла жирные» ГФ X.

Анализ метиловых эфиров жирных кислот проводили методом хромато-масс-спектрометрии на приборе Finnigan-Polaris.

**Условия проведения анализа:** колонка кварцевая капиллярная - 30 м x 0,3 мм; неподвижная жидкая фаза – полидиметилсилоксан SE-30; время анализа – 20 мин; объем вводимой пробы – 0,1 мкл; температура инжектора - 250°С; детектор – масс-спектрометрический, температура - 250°С; газ-носитель – гелий, расход 10 мл/мин; температура колонки программировалась от 225 до 235°С со скоростью 5 град/мин.

Изучение полифенольного комплекса листьев облепихи проводили методом жидкостной хроматографии фирмы Woters с диодной линейкой, использовалась стальная колонка 150x4,0 мм, сорбент Диа. Жирное масло из облепихи крушиновидной получали общепринятыми методами.

Выделение флавоноидов из сырья облепихи крушиновидной осуществлял методом колоночной хроматографии. Полученные фракции анализировали методом бумажной и тонкослойной хроматографии.

Идентификацию выделенных флавоноидов осуществляли по следующим критериям: растворимость в различных растворителях (эфир, хлороформ, спирт различной концентрации, вода очищенная), определение температуры плавления, отсутствию депрессии смешанной пробы со стандартным образцом, хроматографическая подвижность (значение $R_f$, окраска зон адсорбции).

## РЕЗУЛЬТАТЫ И ИХ ОБСУЖДЕНИЕ

Исследованиям в области химических, биохимических, технологических, таксономических и ресурсоведческих видов облепихи флоры Азербайджана посвящено достаточное количество научных работ, которые имеют весомый научно-практический интерес (Musayev və İmaməliyev, 2000; Musayev, 2007a,b, 2010. 2011; Насудари, 1988; Новрузов, 2010, 2011). Нами были дополнительно подвергнуты исследованиям листья и плоды облепихи крушиновидной, произрастающей в Азербайджане (Багиров, 2010). В начале из этого сырья были получены экстракты, которые нарабатывались по следующей технологической схеме: экстракцию измельченных листьев проводили водным ацетоном, затем обрабатывали смесью нефракса и бутилового спирта; очищенную водную фазу концентрировали и высушивали.

Полученные экстракты представляли собой аморфные порошки зеленовато-коричневого цвета со слабым специфическим запахом, вяжущего вкуса; комкуются при хранении; гигроскопичны.

Идентификация их проводилась известными реакциями: растворы экстрактов в 50% этаноле дают положительную реакцию с 1% раствором желатина (появляется хлопьевидный осадок – танинны), с нитритом натрия в кислой среде в течение 60 минут развивается окрашивание раствора от розового до сине-зеленого цвета (эллаготаниты), с раствором железа окисного хлорида в спирте появляется сине-фиолетовое окрашивание (галлоэллаготанины).

Экстракты облепихи крушиновидной представляют собой сухие вещества на основе полифенольных соединений. Результаты анализа показали, что в экстракте листьев присутствуют гидролизуемые таннины, в том числе, стриктинин I, изостриктинин II, казуариктин III, казуаринин IV, гипофенин B V и другие. Общими структурными элементами для этих соединений являются глюкоза, галлоильный и гексагидроксидифеноильный остатки. Из веществ нетаннинновой природы в состав препарата входят метиловый эфир инозита - квебрахит (около 15 %), флавоноиды (не более 20 %), неорганические соли макро- и микроэлементов.

**Оценка сырья плодов облепихи дикорастущей.** Нами были проведены также исследования по выявлению дикорастущей облепихи в различных районах Азербайджана, а также изучению новых гибридных сортов "Зафарани" и "Шафа" на содержание жирного масла и флавоноидов. Нами было изучено жирное масло плодов облепихи крушиновидной. Методом хромато-масс-спектрометрии установлено наличие следующих жирных кислот: тридекановая – 0,9%, гексадекановая – 29,7%, 9-гексадекановая – 31,2%, октадекановая 2,6%, 9-октадеценовая 30,2%, 9,12-октадекадиеновая – 0,7%, 5,11,14, 17- эйкозатетраеновая – 0,5%, 13-докозеновая – 1,3%. Преобладающими компонентами жирного масла изученного образца облепихового масла являются гексадекановая, 9-гексадекановая и 9-октадеценовая (Таблица 1).

Физико-химические свойства флавоноидов из плодов облепихи представлены в Таблице 2.

Таким образом, в результате проведенных экспериментальных исследований установлено, что наибольшее содержание облепихового масла (6,8-7,1%) и флавоноидов (2,5-3,2%) содержится в высокогорных Шекинском и Исмаиллинском районах Азербайджана. Содержание облепихового масла в гибридных сортах "Зафарани" и «Шафа» составило 5-6%, а количество флавоноидов от 2,5 до 3%.

| **Таблица 1.** Содержание жирного масла и флавоноидов из исследуемых объектов облепихи | | |
|---|---|---|
| Районы и дата заготовки плодов облепихи | Выход масла, % | Выход флавоноидов, % |
| Кусарчай, 24 ноября | 5,4 | 2,8 |
| Самур-Девечинский канал, 28 ноября | 5,6 | 3,0 |
| Ахсуинский район, 30 ноября | 5,2 | 2,6 |
| Шеки, 2 декабря | 6,7 | 2,9 |
| Лаиджская местность, 5 декабря | 6,8 | 3,0 |
| Исмаиллинский район, 15 декабря | 7,1 | 2,9 |
| Баку, участок Института генетики и селекции “Зафарани”, 15 августа | 5,5 | 2,7 |
| Баку, участок Института генетики и селекции “Шафа”, 30 октября | 6 | 2,2 |
| Производственные отходы плодов облепихи | 15 | 10 |

| **Таблица 2.** Физико–химические свойства выделенных флавоноидов из изучаемых видов сырья | | | | |
|---|---|---|---|---|
| Наименование вещества | Формула | Т. пл., ºС | $[\alpha]^{20}$ | Источник лекарственного сырья |
| Изорамнетин (3,5,7,4'-тетраокси-3'-метоксифлавон) –F-1 | $C_{16}H_{12}O_7$ | 305-310 | - | Плоды облепихи и ее производственные отходы |
| Кверцетин (3,5,7, 3, 4'- пентаоксифлавон) – F-2 | $C_{15}H_{10}O_7$ | 310-313 | - | Тот же источник |
| Нарциссин (изорамнетин –3-0 (β- ρ - глюкопиранозид или 3-рутинозид изорамнетина) – F-3 | $C_{28}H_{32}O_{16}$ | 174-177 | -10 (С. 0.5 метанол) | Тот же источник |
| Рутин (3-рамногликозид - 3,5,7, 3', 4'-пентаоксифлавон или 3 рутинозид кверцетина) F-4 | $C_{28}H_{32}O_{16}$ | 174-177 | -30 (0.58 этанол) | Тот же источник |
| 7 – рамнозидо-3 –глюкозид изорамнетина – F-5 | $C_{27}H_{30}O_{16}$ | 189-191 | -104,2 (С. 0,1 метанол) | Плоды облепихи |

## ВЫВОДЫ

1. Изучено жирное масло из плодов облепихи крушиновидной. Методом хромато-масс-спектрометрии в жирном масле облепихи крушиновидной установлено наличие следующих жирных кислот: тридекановая – 0,9%, гексадекановая – 29,7%, 9-гексадекановая – 31,2%, октадекановая 2,6%, 9-октадеценовая 30,2%, 9,12-октадекадиеновая – 0,7%, 5,11,14, 17- эйкозатетраеновая – 0,5%, 13-докозеновая – 1,3%. Преобладающими компонентами жирного масла изученного образца облепихового масла являются гексадекановая, 9-гексадекановая и 9-октадеценовая.

2. Из плодов облепихи крушиновидной выделены и идентифицированы с использованием стандартных образцов следующие флавоноиды: изорамнетин, кверцетин, нарциссин, рутин, 7-рамнозидо-3-глюкозид изорамнетина.

3. Из цветков облепихи крушиновидной выделены и идентифицированы следующие флавоноиды: кемпферол, элеагнозид (3-0-β-ρ-глюкопиранозид-7-β[6-II-кумарил галактозид] кемпферола.

## СПИСОК ЛИТЕРАТУРЫ

**Musayev M.K., İmaməliyev Q.N.** (2000) Çaytikanı (*Hippophae rhamnoides* L.) bitkisinin seleksiyası. Genet. və selek. İnstitut. əsərləri. Bakı: 274-278.

**Musayev M.K.** (2007a) Çaytikanı bitkisinin çiçəklənməsinin və meyvəsinin inkişaf xüsusiyyətləri. AMEA Naxçıvan bölgəsi. Xəbərlər, Təbiət və Texniki Elmlər Seriyası, Naxçıvan **2:** 57-60.

**Musayev M.K.** (2007b) Çaytikanıdan məhsuldarlıq elementləri arasında korrelyasiya əlaqələri. Tətbiqi biologiyanın problemləri mövzusunda Resp. Elmi konf. Mater. Bakı: 108-109.

**Musayev M.K.** (2010) Azərbaycanda çaytikanı bitkisinin genetik ehtiyatları, imkanlar və perspektivlər. AMEA Genetik Ehtiyatlar İnstitutunun Elmi əsərləri “Genetik ehtiyatlar və ərzaq təhlükəsizliyi” mövzusunda keçirilmiş Respublika Elmi Konfransının materialları. Bakı, **Elm II:** 194-202.

**Novruzov E.N.** (2011) Azərbaycanda təbii bitki sərvətlərinin öyrənilməsinin vəziyyəti və

istifadəsinin perspektivliyi. Azərbaycan Milli Elmlər Akademiyası Botanika İnstitutu," Faydalı bitkilərdən istifadənin aktual problemləri" mövzusunda Beynəlxalq Konfransın materialları, 26-28 oktyabr 2011, Bakı: 164-171.

**Багиров И.М.** (2010) Фармакогностическое изучение растений семейства лоховые. Автореф. дисс. на соис. ученой степени канд. фарм. наук, Москва: 18 с.

**Мусаев М.К.** (2011) Результаты селекции облепихи в Азербайджане. Новые и нетрадиционные растения и перспективы их использования. Материалы IX Международного симпозиума, Москва **III:** 68-71.

**Насудари А.А.** (1988) Изучение некоторых перспективных флавоноидосодержащих растений из флоры Азербайджана как источников новых лекарственных препаратов: Автореф. дис. док. фармац. наук. Харьков: 24 с.

**Новрузов Э.Н.** (2010) Пигменты репродуктивных органов растений и их значений. Баку: 308 с.

**Флора Азербайджана** (1955) Баку. Изд-во АН Аз. ССР **6:** 307-308

**Novruzov E., Shamsizade L.** (2005) Proc. of I Inter. Rose Hip Conf. Acta Horticulturae **690:** 269-277.

**İ.M. Bağırov**

### Azərbaycan Florasından Çaytikanı (*Hippophae rhamnoides* L.) Bitkisinin Fitokimyəvi Öyrənməsinə Aid

Azərbaycanda bitən çaytikanı dərman bitkisinin fitokimyəvi əlamətləri məqalədə açıqlanır. Aparılan tədqiqatlarda tərkibində olan yağlar ətraflı öyrənilib və fitokimyəvi tərkibi açıqlanıb. Sübut olunub ki, çaytikanı obyekti sənaye əhəmiyyətlidir və əczaçılıq preparatlarının xammalı ola bilər.

**I.M. Bagirov**

### A phytochemical Study of Sea-Buckthorn (*Hippophae rhamnoides* L.) from Azerbaijan Flora

Phytochemical study of sea-buckthorn (*Hippophae rhamnoides* L) growing in Azerbaijan is presented in the paper. Some pharmacognostic properties founded suggest that it could be used for producing pharmaceutical preparations.

*AMEA-nın Xəbərləri (biologiya elmləri), cild 66, №3, səh. 128-131 (2011)*

# Nərə Cinsli Törədici Balıqlardan Cərrahiyyə Üsulu ilə Kürünün Alınması və Zavod Şəraitində Törədici Fondunun Yaradılması

**Ç.A. Məmmədov[1*], Z.S. Salmanov[2], M.M. Axundov[1]**
*[1*]Ekologiya və Təbii Sərvətlər Nazirliyi yanında Azərbaycan Elmi-Tədqiqat Balıqçılıq Təsərrüfatı İnstitutu*
*[2]Xıllı Nərə Balıqartırma zavodu*

**Azərbaycan Respublikasında nərə cinsli ehtiyat törədici fondu 3 istiqamətdə yaradılır: a) vətəgələrdə tədarük edilmiş törədici balıqların bir qismindən yetişmiş kürünün cərrahiyyə üsulu ilə alınması, onların zavod şəraitində saxlanılması (domestikasiya) və balıqartırma məqsədilə növbəti yetkinlik həddinə qədər yetişdirilməsi, b) «kürüdən kürüyə qədər», yəni zavod şəraitində yetişdirilmiş körpələrin cinsi yetkinlik həddinə qədər böyüdülməsi və balıqartırma məqsədilə istifadə edilməsi və nəhayət, c) vətəgələrdə tədarük edilmiş cinsi yetkinlik həddinə çatmamış nərə cinsli balıqların bir qisminin balıqartırma məqsədilə cinsi yetkinlik həddinə qədər zavod şəraitində yetişdirilməsi. Xıllı Nərə Balıqartırma zavodunda artıq 6-cı ildir ki, süni yolla yetişdirilmiş nərə cinsli balıq körpələri əsasında törədici fondu yaradılır. Bu məqsədlə yetişdirilən müxtəlif növlü nərə cinsli balıqların ümumi miqdarı hazırda 4000 ədəd təşkil edir.**
***Açar sözlər:*** *nərə cinsli balıqlar, törədici fondu, kələmo, cərrahiyyə üsulu ilə kürünün alınması, «yumurtalıq yolunun kəsilməsi»*

## GİRİŞ

Nərə cinsli balıqların say miqdarının kəskin surətdə azalması nəticəsində bütün Xəzəryanı Dövlətlərin nərə balıqartırma zavodlarında son illər törədici ana balıq qıtlığı müşahidə olunur (Баранникова и др., 2001; Котенев и др., 2001). Bununla yanaşı, balıqartırma məqsədilə vətəgələrdə ovlanılmış nərə cinsli balıqların bir qismini cinsi yetkinliyə çatmamış fərdlər təşkil edir.

Nərəcinsli balıqların süni yolla artırılmasının hazırki biotexnologiyasına əsasən cinsi məhsullar balıqartırma məqsədilə götürülərkən ana balıqlar öldürülür. Buna görə də, mövcud ekoloji şəraitdə törədici qıtlığının qismən aradan qaldırılması məqsədilə balıqartırma zavodlarında təbii və süni mənşəli balıqlar əsasında yüksək reproduktiv xüsusiyyətlərə malik nərə cinsli törədici ana balıq fondunun yaradılması aktual məsələlərdən biridir.

Müxtəlif növlü nərəcinsli balıqların zavod şəraitində törədici balıq sürülərinin yaradılmasının bioloji əsasları işlənib hazırlanıb (Бурцев, 1969; Подушка, 1986; Смольянов, 1987; Шевченко и др., 2005) və bir sıra ölkələrin balıqartırma müəssisələrində geniş miqyasda istehsalata tətbiq edilir. Azərbaycan Respublikasında isə bu tipli elmi tədqiqat işləri 2005-ci ildən etibarən Xıllı nərə balıqartırma zavodunda həyata keçirilir (Мамедов и др., 2006; Mamedov, 2007; Mamedov et al., 2007).

Alınmış nəticələr mövcud ekoloji şəraitdə nəsli kəsilmək təhlükəsi olan nərəcinsli törədicilərdən daha səmərəli istifadə edilməsi və həmçinin, süni yolla alınmış körpələrin bir qisminin yetkinlik həddinə qədər zavod şəraitində yetişdirilməsi məqsədilə yeni bioloji normativlərin işlənib hazırlanmasında istifadə edilə bilər.

## MATERİAL VƏ METODLAR

Cinsi yetişmiş kürünün törədicilər öldürülmədən cərrahiyyə üsulu ilə («keser üsulu» və «yumurtalıq yolunun kəsilməsi») alınması Azərbaycanın nərə balıqartırma praktikasında ilk dəfə olaraq 2005-ci ildə Xıllı nərə balıqartırma zavodunda həyata keçirilmişdir. Tətbiq edilmiş cərrahiyyə üsullarının metodikaları və istifadə edilmiş nərə cinsli törədicilərin zavod şəraitində saxlanılması qaydaları haqqında geniş məlumat ədəbiyyatda ətraflı şəkildə təsvir edilmişdir (Подушка 1986, 1999).

Nərə cinsli törədicilərdən yetişmiş kürünün cərrahiyyə üsulu ilə alınması texnologiyası 2006 və 2007-ci illərdə də Xıllı nərə balıqartırma zavodunda tətbiq edilmişdir. 2006 və 2007-ci illərdə yetişmiş kürünün kürülü nərə balıqlarından öldürülmədən alınması məqsədilə yalnız «yumurtalıq yolunun kəsilməsi» üsulundan istifadə edilmişdir. Bu üsulun əsas məğzi iki yumurtalıq yolundan birinin neştər vasitəsilə kəsilməsindən ibarətdir (Подушка, 1999). Nərə cinsli törədici balıqlardan ovulyasiya etmiş kürünü məhz bundan sonra sümüklü balıqlarda olduğu kimi süzmək mümkün olur. İstifadə edilmiş törədici balıqların zədələnməsini azaltmaq və kürünün sərbəst süzülməsinin təmin edilməsi məqsədilə əməliyyat zamanı xüsusi masadan istifadə edilmişdir. Kürüsü cərrahiyyə üsulu ilə alınmış fars (Kür) nərəsi (*Acipenser persicus* Borodin) törədicilərinin ümumi miqdarı 2007-cı ildə 4 ədəd təşkil

E-mail: m_chingiz@yahoo.com

etmişdir.

Kürüsü «yumurtalıq yolunun kəsilməsi» üsulu ilə alınmış nərə cinsli balıqlar adaptasiya məqsədilə əvvəlcə ölçüləri 3,0x1,0x1,0m olan plastik hovuzlarda saxlanılmış və 3-5 gün keçdikdən sonra zavodun ərazisində yerləşən ehtiyat nohura köçürülmüşdür. Həmin balıqların balıqartırma məqsədilə növbəti yetkinlik həddinə qədər (domestikasiya) zavod şəraitində saxlanılması planlaşdırılmışdır.

Müxtəlif üsullarla alınmış kürüllərin mayalanması, onların embrional və postembrional inkişaf mərhələləri daimi nəzarətdə saxlanılmış və bir sıra morfo-bioloji xüsusiyyətləri - inkişaf göstəriciləri, dolğunluq əmsalı (Fulton əmsalı), gündəlik artım sürəti və onların hovuzlarda yaşaması müqayisəli şəkildə analiz edilmişdir.

Xıllı nərə balıqartırma zavodunda vətəgələrdə ovlanılmış cinsi yetkinliyə çatmamış fərdlər əsasında da ehtiyat törədici fondu formalaşdırılır. Bu məqsədlə tədarük edilmiş nərə cinsli balıqların ümumi miqdarı hazırda 50 ədəd təşkil edir. Vətəgələrdə ovlanılmış cinsi yetkinliyə çatmamış fərdlər əsasında zavod şəraitində ehtiyat törədici fondunun formalaşdırılması prosesi gələcəkdə də davam etdiriləcəkdir.

Törədici fondu yaradılması məqsədilə 2007-ci ildə zavod şəraitində süni yolla alınmış körpələr əsasında əlavə 2000 ədəd (kələmo - 500 ədəd, nərə – 500 ədəd və uzunburun – 1000 ədəd) nərə cinsli balıq körpələri ayrılmışdır. Onların süni yemlə yemləndirilməsi və müxtəlif hovuzlarda yetişdirilməsi nərə cinsli balıqlar üçün qəbul olunmuş normativlər əsasında həyata keçirilir. Müxtəlif yaş qruplarına mənsub olan balıqlar arasında il ərzində 2 dəfə seçmə həyata keçirilir və 2007-ci ildən etibarən onların pasportlaşdırılması əməliyyatına başlanılmışdır.

Balıq yetişdirilən hovuzlarda suyun hidrokimyəvi göstəriciləri daimi nəzarət altında olmuşdur. Suyun temperaturu, suda həll olmuş oksigenin miqdarı (Oxi-330i), suyun qələvilik və ya turşuluq göstəricisi (pH-330i), ümumi minerallığı və duzluluğu (Cond-330i), nitrat, nitrit və ammonium azotunun miqdarı və eyni zamanda bəzi ağır metallar (Nanocolor-500D və PF-11 spektrofotometrləri) qeyd olunmuş cihazların vasitəsilə təyin edilmişdir.

Nərə cinsli körpələrin yetişdirilməsi zamanı *Artemia salina* naupliuslarından, müxtəlif ölçülü su xərçəngləri - *Daphnia magna*, oliqoxet qurdları - *Enchytraeus albidus* və həmçinin, zavodun müəyyən resept üzrə (şərti olaraq St-07 Kür) istehsal etdiyi qranul şəkilli müxtəlif ölçülü süni yemlərdən istifadə edilmişdir.

Gündəlik yem rasionu yemin növündən (canlı və ya süni yem), yemləndirilən korpələrin ölçülərindən və kütləsindən və həmçinin, suyun temperaturundan asılı olaraq 15-20%-dən (sürfələr üçün) 2-3% (təmir-törədici balıqlar) arasında dəyişmişdir.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Kürüləri müxtəlif üsullarla alınmış törədici fars (Kür) nərələrinin reproduktiv göstəricilərinin öyrənilməsi məqsədilə onlardan alınmış kürünün miqdarı, keyfiyyəti, embrionların və körpələrin müxtəlif mərhələlərdə inkişafı müqayisəli şəkildə araşdırılmışdır. Əsas reproduktiv göstəricilərin analizi onlar arasında müəyyən fərqlər olduğunu göstərmişdir. «Yumurtalıq yolunun kəsilməsi» üsulu ilə alınmış kürünün miqdarı kürülü balığın kütləsinin 16,0-16,7%-ni, «keser üsulu» ilə alınmış kürünün miqdarı kürülü balığın kütləsinin 18,0-19,0%-ni, kürüsü ənənəvi yolla alınmış balıqlarda isə bu göstərici 20-21,0% təşkil etmişdir (Cədvəl 1).

Embrional inkişaf dövründə aparılan müşahidələr göstərmişdir ki, kürünün alınma üsulu, onların mayalanma qabiliyyətinə və embrionların normal inkişafına mənfi təsir göstərmir. 4 blastomer mərhələsində aparılmış müşahidələrə əsasən ənənəvi üsulla alınmış kürülərdə mayalanmayan kürülər orta hesabla 3,5%, polispermiya isə 2,0% təşkil etmişdir. Cərrahiyyə üsulu ilə alınmış kürülərdə isə bu rəqəmlər müvafiq olaraq 4,1% və 2,6% təşkil etmişdir.

Balıqlar yetişdirilən hovuzlarda 2007-ci ildə suda həll olmuş oksigenin miqdarı 6,5-9,8 mq/l,

**Cədvəl 1.** Kürüləri müxtəlif üsullarla alınmış törədici nərə balıqlarının reproduktiv göstəriciləri

| Göstəricilər (*A. persicus*) | Kürünün alınma üsulu | | |
|---|---|---|---|
| | ənənəvi | «keser üsulu» | «yumurtalıq yolunun kəsilməsi» |
| Balığın uzunluğu (L/l), sm | 164/149 | 165/150 | 162/148 |
| Balığın kütləsi (P), kq | 28 | 30 | 30 |
| Alınmış kürünün miqdarı, kq, % | 5,7 | 5,69 | 5,0 |
| | 20,3 | 19,0 | 16,7 |
| 1,0 qram kürüdə olan oositlərin miqdarı, ədəd | 52 | 53 | 50 |
| İşçi məhsuldarlığı, ədəd | 296000 | 301850 | 250000 |
| Kürünün mayalanma faizi (%), (17 mərhələ) | 90,0 | 87,7 | 93,6 |
| Aktiv qidalanma dövründə sürfələrin çıxışı, % | 85 | 82 | 87 |




**Şək.1.** Xıllı Nərə Balıqartırma zavodunda yetişdirilən müxtəlif növlü nərə cinsli balıq növlərinin 2004-2009-cu illər ərzində inkişaf dinamikası.

suyun qələvilik və ya turşuluq göstəricisi (pH) 7,4-8,5 arasında olmuşdur. Nitrat, nitrit və ammonium azotunun ümumi miqdarı müvafiq olaraq 0,9-1,8mq/l, 0,03-0,11 mq/l və 0,1-0,23mq/l olmuşdur.

Ehtiyat törədici fondu məqsədilə nohurda saxlanılan nərə balıqları bonitirovka üsulu ilə ildə 2 dəfə ovlanılır, onların morfo-bioloji göstəriciləri və həmçinin, inkişaf dinamikası qeyd olunur. Növbəti balıqartırma mövsümü ərəfəsində biopsiya metodu ilə onların reproduktiv xüsusiyyətlərinin araşdırılması nəzərdə tutulmuşdur.

Nərə cinsli balıqlardan yetişmiş cinsiyyət məhsullarının törədicilər öldürülmədən alınması onların yenidən balıqartırma məqsədilə istifadə edilməsi məqsədi daşıyır. Kürüsü cərrahiyyə üsulu ilə alınmış zavod şəraitində saxlanılan nərə cinsli balıqlardan yenidən balıqartırma məqsədilə səmərəli istifadə edilməsi üçün onların ekoloji tələbatına müvafiq şərait yaradılmalıdır.

Qeyd olunduğu kimi, Xıllı nərə balıqartırma zavodunda ehtiyat törədici nərə balıq fondu yalnız kürüsü cərrahiyyə üsulu ilə alınmış törədicilərin domestikasiyası və vətəgələrdə ovlanılmış cinsi yetkinlik həddinə çatmamış fərdlər hesabına deyil, əsasən süni yolla yetişdirilən körpələrdən gələcək ana balıq sürülərinin formalaşdırılması yolu ilə həyata keçirilir. 2004-cü ildən etibarən təmir-törədici fondu məqsədilə yetişdirilən nərə cinsli balıqların ümumi miqdarı hazırda 4000 ədəd təşkil edir.

2004-cü ildə Xıllı nərə balıqartırma zavodunda süni yolla alınmış və təmir-törədici fondu yaradılması məqsədilə yetişdirilən müxtəlif növ nərə cinsli balıq körpələrinin ayrı-ayrı illər üzrə inkişaf dinamikası və morfo-bioloji göstəriciləri Cədvəl 1-də göstərilmişdir.

Xıllı nərə balıqartırma zavodunda təmir-törədici fondu məqsədilə qeyd olunan növlərdən əlavə, 2005-ci ildə Rusiya Federasiyasının Həştərxan vilayətindən gətirilmiş digər nərə cinsli növlər də (bester, Rus nərəsi, Sibir nərəsi və cökə balıqları) yetişdirilir. Yetişdirilən nərə cinsli balıq növlərinin ayrı-ayrı illər üzrə inkişaf dinamikası Şək. 1-də göstərilmişdir. Həmin növlərin Azərbaycan Respublikası şəraitində yetişdirilməsi və onların inkişaf dinamikasının öyrənilməsi elmi maraq kəsb etdiyi üçün bu sahədə tədqiqat işləri davam etdiriləcəkdir.

Qeyd etmək lazımdır ki, təmir-törədici fonduna mənsub olan balıqların yemləndirilməsi yalnız zavodun müəyyən resept əsasında (şərti olaraq St-07 Kür) istehsal etdiyi süni yem hesabına həyata keçirilmişdir.

Zavod şəraitində yetişdirilən nərə cinsli balıq körpələri böyüdükcə müxtəlif yaş qruplarına mənsub olan fərdlər arasında gələcək ana balıq sürülərinin yaradılması məqsədilə kütləvi və dəqiqləşdirici seçmə aparılması planlaşdırılır. Gələcək ana balıq sürülərinin formalaşdırılması məqsədilə müxtəlif yaş qruplarına mənsub olan nərə cinsli balıqların ekspres metodla cinsiyyətinin təyin edilməsi də nəzərdə tutulmuşdur.

## ƏDƏBİYYAT

**Баранникова И.А., Белоусов А.Н., Никаноров С.И., Малютин В.С.** (2001) Положение с осетровыми сложнее, но не безнадежное. Рыбоводство и рыболовство **1:** 4-6.

**Бурцев И.А.** (1969) Способ получения икры от самок рыб. Авторское свидетельство СССР. № 244793. Открытия. Изобретения, **28**: 143.

**Детлаф Т.А., Гинзбург А.С., Шмальгаузен О.И.** (1981) Развитие осетровых рыб. М., Наука: 224.

**Котенев Б.Н., Бурцев И.А., Николаев А.И., Дергалева Ж.Т.** (2001) Стратегия сохранения осетровых. Рыбоводство и рыболовство **1:** 10-13.

**Мамедов Ч.А., Гаджиев Р.В., Ахундов М.М.** (2006) Новые технологии осетроводства в Азербайджане. AMEA Zoologiya İnstitutunun əsərləri **XXVIII:** 674-683.

**Подушка С.Б.** (1986) Способ получения икры от самок осетровых рыб. Авторское свидетельство СССР: № 1412035.

**Подушка С.Б.** (1999) Получение икры у осетровых с сохранением жизни производителей. Научно-технический бюллетень лаборатории ихтиологии ИНЭНКО, Санкт-Петербург: 4-19.

**Смольянов И.И.** (1987) Технология формирования и эксплуатации маточного стада сибирского осетра в тепловодных хозяйствах. М., ВНИПРХ: 33.

**Шевченко В.Н., Пискунова Л.В., Попова А.А.** (2005) Результаты эксплуатации маточного стада осетровых рыб на рыбоводных заводах дельты Волги. Рыбохозяйственные исследования на Каспии: Результаты НИР за 2004 г., Астрахань: 545-555.

**Mamedov Ch.A.** (2007) New technologies for sturgeon-breeding in Azerbaijan. International Workshop on Advanced Techniques in Sturgeon Fish Larviculture. Iran, Urmia: 12-13.

**Mamedov Ch.A., Akhundov M.M., Gadjiyev R.V.** (2007) Innovations in Sturgeon Stock Enhancement: Case Study on Azerbaijan Sturgeon Hatchery. Procedings of the 9-th Baku International Congress: Energy, Ecology, Economy, Baku: 419-424

**Ч.А. Мамедов, З.С. Салманов, М.М. Ахундов**

## Прижизненный Способ Получения Икры от Производителей Осетровых и Создание их Маточного Стада в Заводских Условиях

На Хыллинском Осетровом рыбоводном заводе Азербайджанской Республики с 2005 г. внедряется прижизненный способ получения зрелой икры от производителей осетровых рыб. Зрелая икра от производителей осетровых рыб получается методами «кесарева сечения» и «надрезания яйцевода». Производители осетровых рыб, от которых зрелая икра была получена прижизненным способом, выдерживаются в заводских условиях в целях повторного рыбоводного использования. В условиях Хыллинского ОРЗ Азербайджанской Республики формируется также ремонтно-маточное стадо осетровых на основе молоди искусственной генерации. В целях сохранения биоразнообразия считаем необходимым, использовать для создания маточных стад производителей осетровых рыб различных биологических групп, а также исчезающих (куринский шип).

**Ch.A. Mamedov, Z.S. Salmanov, M.M. Akhundov**

## The *in vivo* Technique of Getting Roe from Parental Sturgeon Fish and Formation of Their Recovery-Maternal Stock in Khilli Sturgeon Hatchery of Azerbaijan Republic

The *in vivo* technique of getting mature roe from the parental sturgeon fish has been introduced in Khilli sturgeon hatchery for the first time in sturgeon-breeding practice of Azerbaijan Republic. The mature roe is got from the parental fish by conducting Caesarean and oviduct sections. The parental sturgeon fish from is being kept in the Khilli Sturgeon Hatchery for the purpose of their domestication. In the Khilli Sturgeon Hatchery the repair-maternal stock of sturgeon fish is formed by applying the juveniles of artificial generation. For the purpose of biodiversity protection, the application of parental sturgeon fish breeders of different biological groups as well as extinct sturgeon fish (Kura-river ship) for maternal stock formation is considered to be important.

*AMEA-nın Xəbərləri (biologiya elmləri), cild 66, №3, səh.132-136 (2011)*

# Şirvanda Vəhşi və Əhli Ətyeyən Heyvanların Başlıca Helmintoz Törədicilərinin Təbii və Sinantrop Ocaqlılıqları

**Q.H. Fətəliyev*, M.Ş. Yolçuyev, R.Ş. İbrahimova**
*AMEA Zoologiya İnstitutu, keçid 1128, məhəllə 504, Bakı, AZ107*

**Məqalədə Şirvan ərazilərində başlıca helmintoz törədicilərinin təbii və sinantrop ocaqlılıqlarının yaranmasında vəhşi və əhli ətyeyən heyvanların, aralıq sahiblərin və bir sıra ekoloji amillərin rolunun öyrənilməsi barədə məlumat verilir. Aparılmış tədqiqat zamanı bu ərazilərdə dipilidioz, exinokokkoz, dirofilyarioz, trixinellyoz, toksokaroz, ankilostomatoz törədicilərinin təbii və sinantrop ocaqlılıqları aşkar edilmişdir. Bu ərazilərdə mövcud ocaqlılıqların saxlanma və yayılma səbəbləri müəyyən edilərək, onlara qarşı bəzi profilaktik mübarizə tədbirləri təklif edilir.**

## GİRİŞ

Azərbaycan Respublikasının təbii iqlim şəraiti, bitki və torpaq örtüyünün xüsusiyyətləri bu ərazilərdə müxtəlif növ ev və vəhşi məməli heyvanların, quşların, gəmiricilərin, sürünənlərin, həşəratların geniş yayılmasına səbəb olmuşdur. Bu qrup heyvanlar bir çox qorxulu helmintoz törədicilərinin təbii ocaqlılıqlarının yaranması, saxlanılması və genişlənməsində mühüm rol oynayır.

Son zamanlar respublikada heyvanların növ müxtəlifliyini qorumaq məqsədilə dəri tədarükü edilmədiyindən vəhşi heyvanlar ovlanılmır. Ona görə də vəhşi heyvanların sıxlığı daha da artmışdır. Heyvanların sıxlığı artdıqca onlar qida ilə əlaqədar olaraq təbii ocaqlılıqdan sinantrop ocaqlılığa mütəmadi olaraq daxil olurlar. Eyni zamanda rayon və şəhərətrafı yaşıllıqların salınması, quşçuluq təsərrüfarlarının yaradılması və s. vəhşi heyvanların qidalanması üçün yaşayış məskənlərinə daxil olmasına əlverişli şərait yaradır.

Bununla əlaqədar olaraq, vəhşi heyvanlar təbii biotoplardan sinantrop biotoplara daxil olmaqla əhli ətyeyən heyvanlar arasında invaziya mübadiləsi yaradır.

Respublika ərazisində vəhsi və sənaye əhəmiyyətli xəzdərili heyvanlar üzərində uzun illərdən bəri professor İ.Ə. Sadıqovun apardığı məqsədyönlü helmintoloji tədqiqatlar – insan və ev heyvanlarının helmintozlarının təbii ocaqlılığının aşkar edilməsində böyük əhəmiyyət kəsb edir. O, müəyyən etmişdir ki, helmintlərin təbii ocaqlılığının yaranmasında vəhşi heyvanlar; sinantrop ocaqlılıqda isə əhli ətyeyən heyvanlar əsas rol oynayır (Sadıqov, 1999; Sadıqov və s., 2001; Садыхов, 1971, 1978, 1981).

Bundan başqa Azərbaycanda itlərin helmintləri öyrənilərkən itdə tapılmış 36 növ helmintdən 26 növün təbii ocaqlılıqda dövr etməsi barədə məlumat vardır (Асадов, Исмаилов, 1972; Садыхов, Елчуев, 1985).

Yoluxmuş vəhşi və əhli ətyeyən heyvanlar ətraf mühiti və otlaqları helmintoz törədicilərinin invazion yumurtaları ilə çirkləndirərək gövşəyən heyvanların və insanların yoluxmasına səbəb olurlar. Bəzi helmintlər cinsi yetkin mərhələdə vəhşi heyvanlarda, sürfə mərhələsində isə gövşəyən heyvanlarda parazitlik edirlər. Beləliklə, vəhşi və əhli ətyeyən heyvanlar helmintoz törədicilərinin əsas sahibləri olmaqla bərabər, həm də onların daşıyıcısı və yayıcısıdırlar.

E.N. Pavlovskiyə görə təbii ocaqlılığın baş verməsi üçün helmintoz törədicilərinə görə qeyri - sağlam ərazidə yoluxmaya həssas olan sağlam heyvan, ötürücü amil və xəstə heyvan olmalıdır. Yoluxmuş vəhşi və əhli ətyeyən heyvanlar helmintoz törədiciləri ilə sağlam heyvanı və insanı yoluxdururlar (Павловский, 1964, 1964а).

Ədəbiyyat məlumatına görə MDB ölkələri ərazilərində vəhşi və ev heyvanlarında 30-dan yuxarı infeksion və invazion xəstəliklər məlumdur (Галузо и др., 1968; Павловский, 1939).

Azərbaycanın müxtəlif ərazilərində uzun illərdən bəri vəhşi və əhli ətyeyən heyvanların helmintfaunası və onun formalaşmasına təsir edən amillərin bəzi qanunauyğunluqlar bir sıra tədqiqatçılar tərəfindən öyrənilmişdir (Fətəliyev, 2003; Fətəliyev və s., 2006).

Şirvan ərazilərində isə xəstəliklərin təbii ocaqlılıqlarının aşkar edilib, onun təbiətdə saxlanılması və genişlənməsi yolları hal - hazıra kimi aktual problem olaraq qalmaqdadır. Çünki göstərilən ərazidə insan və heyvanlar üçün təhlükəli olan helmintoz törədicilərinin təbii ocaqlılıqlarının yaranmasında vəhşi və əhli ətyeyən heyvanların və bəzi invaziya ötürücülərinin rolu bu günə qədər öyrənilməmişdir.

Ocaqlılığı təmin edən amillərin hər birinin ayrı -ayrılıqda bioekoloji xüsusiyyətləri və göstərilən ərazilərdə onların nə dərəcədə yayılmasının aşkar edilməsinin bu helmintoz törədiciərinə qarşı

mübarizə tədbirlərinin işlənib hazırlanmasında böyük elmi və praktiki əhəmiyyəti vardır.

Bunları müəyyən etməklə, gələcəkdə bu ərazilərdə təbii və sinantrop ocaqlılığın yaranması və onun törədicilərinin yayılmasının qarşısını almaq üçün mübarizə tədbirləri hazırlamaq mümkündür.

## MATERİAL VƏ METODLAR

Şirvanda vəhşi və əhli ətyeyən heyvanların başlıca helmintoz törədicilərinin təbii və sinantrop ocaqlılıqlarını öyrənmək məqsədilə müxtəlif ərazilərdən 24 sahibsiz it, 28 ev pişiyi, 24 çaqqal, 26 tülkü tam helmintoloji yarma üsulu ilə tədqiq edilmişdir (Скрябин, 1928).

Aşkar edilmiş helmintlərdən trematod və sestodlar 70%-li spirtdə, nematodlar isə 4% -li formalində fiksə edilmişdir.

Trematod və sestodların növ tərkibinin təyin edilməsində zəyli karmindən boyayıcı maddə hazırlanmış və helmintlər rənglənmişdir. Helmintlər ardıcıl spirt cərgəsindən (60, 70, 80, 90, $96^0$) keçirildikdən sonra üzərinə kanada balzamı əlavə edilərək daimi preparatlar hazırlanmışdır.

Nematodlar isə 4%-li formalindən çıxarılaraq distillə suyunda yuyulur və əşya şüşəsi üzərinə keçirilir. Nemarodun üzərinə qliserin və süd turşusu qarışığından hazırlanan məhluldan damcılar əlavə edilir, örtücü şüşə ilə örtülərək mikroskop altında növ tərkibi təyin edilmişdir.

## NƏTİCƏLƏR VƏ ONLARİN MÜZAKİRƏSİ

Tədqiqat nəticəsində vəhşi və əhli ətyeyən heyvanlarda 34 növ helmint aşkar edilmişdir.

Aşkar edilmiş helmintlərdən 1 növü trematod, 18 növü sestod, 1 növü akantosefal, 14 növü nematodlar sinfinə aiddir.

Bu helmintlərin inkişaf dövriyyəsinə görə 27 növü biohelmint, 7 növü isə geohelmintdir.

Tədqiqat işi aparılarkən ərazilərdə biotopların xüsusiyyəti, heyvanın həyat tərzi, ərazidə olan aralıq sahiblərinin nə dərəcədə yayılması nəzərə alınmışdır.

Yoluxmanın təbii ocaqlılıq şəklində yaranmasını, yayılmasını və parazitin növbədə müəyyən ərazidə dövr etməsini təmin edən aralıq sahiblərdir. Göstərilən ərazilərdə bizim tərəfimizdən aparılmış tədqiqat zamanı məlum olmuşdur ki, bəzi başlıca helmintoz törədicilərinin ocaqlılığının yaranmasında və onun təbiətdə törədicilər tərəfindən dövr etməsində aralıq sahib kimi həşəratların, gəmiricilərin, sürünənlərin rolu böyükdür.

Bunu nəzərə alaraq, təbii ocaqlılığın yaranmasında əsas rol oynayan aralıq, ehtiyat və əlavə sahiblərdən – müxtəlif növ həşəratlar, gəmiricilər, sürünənlər əldə edilərək onların rolu təhlil edilmişdir (Cədvəl 1).

Aşkar edilmiş helmintlərdən aralıq sahibləri həşəratlar olan *D.caninum, M.catulinus, Sp.lupi, D.repens*-i xüsusi qeyd etmək lazımdır.

D.caninum – tülküdə 26,6%, çaqqalda 27,2%, sahibsiz itlərdə 43,6%, ev pişiklərində isə 39,7% təşkil edir. Bu helmintin heyvanlar arasında yayılmasında it (*Ct. canis*) və pişik (*Ct. felis*) birələrinin əsas rol oynadığını nəzərə alaraq həmin heyvanların üzərindən 256 fərd it və 425 fərd pişik birələri toplanılaraq tədqiq edilmişdir. Tədqiqat zamanı it birələrinin 37,4%, pişik birələrinin isə 13,8% sistiserkoidlərlə yoluxması aşkar edilmişdir .

İnkişaf dövriyyəsi həşəratlarla gedən *D.repens* bizim tədqiqatımızda Şirvan ərazilərində tədqiq edilmiş 10 itdən 2- də 22 fərd (20%), 11 tülkünün 1-də 7 fərd (9,1%) aşkar edilmişdir. Bu helmintin vəhşi və əhli ətyeyən heyvanlar və insanlar arasında yayılmasında əsas ötürücü amil olan *Anopheles* və *Audes* cinsindən olan ağcaqanadlardır.

Tədqiqat zamanı aralıq sahibləri gəmiricilər olan helmintlərin də bu ərazilərdə heyvanlar arasında geniş yayılması aşkar edilmişdir. Bu helmintlərə *J.rossicum*, *T.pisiformis, T.crassiceps, H.taeniaeformis, H.krepkoqorski, Tr.spiralis* aiddir.

Bu helmintlərdən *Tr.spiralis* xüsusi epizootoloji və epidemioloji əhəmiyyət kəsb edir. Bu helmintlə yoluxma tulküdə - 18,1%, çaqqalda – 7,7% təşkil etmişdir. Sinantrop ocaqlılıqda isə *Tr.spiralis* it və pişiklərdə çox az qeydə alınmışdır. *Tr.spiralis*-in yayılmasında gəmiricilər əsas rol oynayır.

Tədqiqat zamanı bu ərazilərdə yayılmış aralıq sahibləri sürünənlər olan bir neçə helmint növü aşkar edilmişdir. İlk dəfə olaraq vəhşi və əhli ətyeyən heyvanlarda aşkar edilmiş *A.alata, D.nölleri, Sp.erinacei – europei, J.echinorhynchoides*, *J.pasqualei, M.lineatus, M.catulinus, Sp.lupi, Ph.sibirica* növlərinin yayılmasında sürünənlərin ehtiyat, əlavə və aralıq sahib kimi rolu müəyyən edilmişdir.

*M.lineatus* növünün ehtiyat sahibi sürünənlərdən olan qafqaz kələzinin, yaşıl kərtənkələnin əzələ toxumalarında hər görüş dairəsində 6-7 fərd miqdarında spiroserk aşkar edilmişdir.

Şirvan ərazilərində aşkar edilmiş helmintlərdən aralıq sahibləri gövşəyən heyvanlar olan *E.granulosus, M.multiceps, T.hydatigena* və *T.ovis* növləri vəhşi və əhli ətyeyən heyvanlar arasında qeyd edilmişdir.

Şirvan ərazilərində *E.qranulosus*-la yoluxma itdə 20-25% arasında, *T.hydatigena* ilə yoluxma tülküdə 27,2%, çaqqalda 15,3%, sahibsiz itlərdə isə 49,9% təşkil etmişdir.

**Cədvəl 1**. Şirvan ərazilərində təbii ocaqlılıqların yaranmasında aralıq və ehtiyat sahiblərinin iştirakı

| Helmintin adı | aralıq və ehtiyat sahiblər | | | |
|---|---|---|---|---|
| | gövşəyən heyvanlar | həşəratlar | gəmiricilər | sürünənlər |
| *Alaria alata* | - | - | - | + |
| *Dipylidium caninum* | - | + | - | - |
| *D.nölleri* | - | - | - | + |
| *Sp.erinacei-europei* | - | - | - | + |
| *Joyeuxiella echinorhynchoides* | - | - | - | + |
| *J.rossicum* | - | - | + | - |
| *J.pasqualei* | - | - | - | + |
| *Taenia hydatigena* | + | - | - | - |
| *T.ovis* | + | - | - | - |
| *T.pisiformis* | - | - | + | - |
| *T.crassiceps* | - | - | + | - |
| *Hydatigera taeniaeformis* | - | - | + | - |
| *H.krepkoqorski* | - | + | + | - |
| *Multiceps multiceps* | + | - | - | - |
| *Echinococcus qranulosus* | + | - | - | - |
| *Mesocestoides lineatus* | - | + | - | + |
| *Macracanthorhynchus catulinus* | - | + | - | + |
| *Trichinella spiralis* | - | - | + | - |
| *Spirocerca lupi* | - | + | - | + |
| *Physaloptera sibirica* | - | - | - | + |
| *Dirofilaria repens* | - | + | - | - |

Tədqiqat aparılan ərazilərin Şamaxı, İsmayıllı, Ağsu, Ucar, Kürdəmir, Göyçay rayonları ərazilərində biohelmintlərlə yanaşı təbii və sinantrop ocaqlılıq əmələ gətirən geohelmintlərdən *A.caninum, U.stenocephala, T.canis, T.mystax, T.leonina* geniş yayılmışdır. Bəzi başlıca helmintoz törədicilərinin yayılmasında biotik və abiotik amillərin təsiri ilə yanaşı sosial amillər də mühüm rol oynayır. Belə ki, Şirvan ərazilərində yaradılmış şəxsi və fermer təsərrüfatlarının ətraflarında çoxlu sayda vəhşi heyvan, sahibsiz it və pişiklər toplanır. Həmin təsərrüfatlarda ölmüş və kəsilmiş heyvanların helmintoz törədiciləri ilə yoluxmuş daxili orqanları bəzən zərərsizləşdirilmədən ətraf mühitə atıldıqda həmin heyvanlar tərəfindən yeyilir və helmintoz törədiciləri ilə yoluxur. Bu qidalanma yerlərində vəhşi heyvanlarla əhli ətyeyən heyvanlar (it və pişiklər) arasında biosenotik əlaqə yaranır və bu zaman təbii ocaqlılıqdan sinantrop ocaqlılığa keçid əmələ gələrək helmint mübadiləsi baş verir. Beləliklə, helmintoz törədiciləri hər iki ocaqlıqda saxlanılır və yayılır.

Aparılan tədqiqat zamanı Şirvan ərazilərinin bütün rayonlarında (Şamaxı, İsmayıllı, Kürdəmir, Ağsu, Ucar, Göyçay) dipilidioz, dirofilyarioz, exinokokkoz, tenidioz, trixinellyoz, ankilostomatoz və toksokarozun törədicilərinin təbii və sinantrop ocaqlılığı aşkar edilmişdir.

Belə ki, dipilidiozun təbii və sinantrop ocaqlılığı müəyyən edilmişdir. Zəif təbii ocaqlılığın yaranması vəhşi heyvanlar və birələr arasında; güclü sinantrop ocaqlılığın yaranması isə it, pişik, birə və insanlar arasında baş verir. Dipilidiozun törədicisi təbii ocaqlılıqdan sinantrop ocaqlılığa və əksinə, daxil olaraq hər iki ocaqlılığın yaranmasında iştirak edir.

Dirofilyarioz Göyçay və Ucar rayonları ərazilərində təbii ocaqlılıqda vəhşi heyvanlarla ağcaqanadlar; sinantrop ocaqlılıqda isə it, pişik, ağcaqanad və insanlar arasında saxlanılaraq dövr edir. Hər iki ocaqlılıqda əsas aralıq sahib kimi ağcaqanadlar iştirak edir.

Trixinellyozun MDB ölkələrində təbii ocaqlılıqda vəhşi heyvanlar və gəmiricilər arasında; sinantrop ocaqlılıqda isə ev donuzları, it, pişik və bəzən də gəmiricilər arasında baş verməsi məlumdur (Бессонов, 1972). Bizim tədqiqatımızda trixinellyozun Şamaxı və İsmayıllı rayonları ərazilərində təbii ocaqlılıqda daha güclü, sinantrop ocaqlılıqda isə çox zəif yayılması aşkar edilmişdir.

Tədqiqat aparılan ərazilərin Şamaxı, İsmayıllı, Ağsu, Ucar, Kürdəmir, Göyçay rayonları ərazilərində biohelmintlərlə yanaşı təbii və sinantrop ocaqlılıq əmələ gətirən geohelmintlərdən *A. caninum, U. stenocephala, T. canis, T. mystax, T. leonina* geniş yayılmışdır.

Bu helmintlərin invazion yumurtaları təbii mühitdə öz yaşama qabiliyyətini uzun müddət saxladıqlarından təbii ocaqlılıqda vəhşi heyvanların; sinantrop ocaqlılıqda isə əhli ətyeyən heyvanların və insanların unsiarioz, ankilostomatoz və toksokaroz törədiciləri ilə yoluxmasına səbəb olurlar.

Beləliklə, Şirvan ərazilərində aparılmış helmintoloji tədqiqat nəticəsində müəyyən edilmişdir ki, bu ərazilərdə başlıca helmintoz törədicilərinin təbii və sinantrop ocaqlılığın yaranması, saxlanması və genişlənməsində vəhşi və əhli ətyeyən heyvanların, aralıq, əlavə sahiblərin və sosial faktorların rolu böyukdür. Hər iki halda – təbii və sinantrop ocaqlılığın yaranması və yayılmasında vəhşi və əhli ətyeyən heyvanlar, müxtəlif növ həşəratlar, gəmiricilər, sürünənlər iştirak edir.

Təbiətdə və təsərrüfatlarda insanların fəaliyyəti nəticəsində daim helmintoz törədicilərinin dövriyyəsi baş verir. Ona görə də təbiəti bu cür invazion xəstəlik törədicilərinə görə sağlamlaşdırmaq məqsədilə müxtəlif elmi və praktiki tədbirlərin həyata keçirilməsi tələb olunur.

Bunları nəzərə alaraq, Şirvan ərazilərində mövcud olan təbii və sinantrop ocaqlılıqlarda başlıca helmintoz törədicilərinin dövr etmə yollarının pozulması, yeni ocaqlılıqların yaranmasının və genişlənməsinin qarşısının alınması istiqamətinə əsaslanan aşağıdakı profilaktik tədbirlər həyata keçirilməlidir:

- başlıca helmintioz törədicilərinin (dipilidioz, exinokokkoz, toksokaroz, ankilostomatoz, unsinarioz, dirofilyarioz) sinantrop ocaqlılıqda əsas daşıyıcısı və yayıcısı olan sahibsiz it və pişiklərin təsərrüfatlara, məişət ocaqlarına, uşaq bağcaları və məktəblərin həyətlərinə daxil olmasının qarşısı alınmalıdır;
- exinokokkoz, senuroz, sistiserkoz, teniidioz kimi helmintoz törədicilərinin yayılmasının qarşısını almaq üçün baytar-sanitariya nəzarətindən keçməyən ətkəsmə məntəqələri ləğv edilməli, kəsilmiş kənd təsərrüfatı heyvanlarının xəstə orqanları ilə vəhşi və əhli ətyeyən heyvanların qidalanmasının qarşısı alınmalıdır;
- təbii ocaqlılıqda trixinellyozun yayılmasının qarşısının alınması üçün ov mövsümündə vurulmuş vəhşi heyvanların cəsədləri yandırılmalı və ya dərin basdırılmalıdır;
- təbii ocaqlılıqla sinantrop ocaqlılıq arasında əlaqə yaradan, infeksion və invazion xəstəliklərin yayılmasında aralıq, ehtiyat və əlavə sahib kimi iştirak edən müxtəlif növ həşəratlara, gəmiricilərə və sürünənlərə qarşı mübarizə tədbirləri işləyib hazırlamaq lazımdır. Çünki yoluxma və yoluxdurma yollarında əsas mənbə aralıq sahiblərdir;
- vəhşi və əhli ətyeyən heyvanların qoyunçuluq və maldarlıq təsərrüfatlarına daxil olmasının qarşısı alınmalı, it və pişiklərin sayının azaldılmasına nəzarət artırılmalıdır.

Belə bir vəziyyət daim tibb və baytar işçilərinin diqqət mərkəzində olmalıdır.

## ƏDƏBİYYAT


**Sadıqov İ.Ə.** (1999) İnsan və ev heyvanlarının başlıca helmintozlarının ocaqlılığına dair. AMEA-nın Xəbərləri **1:** 38-42.

**Sadıqov İ.Ə., Yolçuyev M.Ş., İbrahimova R.Ş.** (2001) Abşeron və cənubi-şərqi həmsərhəd rayonlarında ətyeyən əhlı heyvanların başlıca helmintoz törədicilərinin ekolojı xüsusiyyətləri.Akad. M.Ə.Musayevin 80 illiyinə həsr olunmuş elmı konfransın materialları. Bakı, Elm: 191-193.

**Fətəliyev Q.H.** (2003) Azərbaycanda vəhşi məməlı heyvanlarda spiruridlərin növ müxtəlifliyinin öyrənilməsi və onların ekolojı xüsusiiyətləri. "Azərbaycan Zooloqlar Cəmiyyətinin "I-ci Qurultayının Mater. Bakı, Elm: 69-74.

**Fətəliyev Q.H.,Yolçuyev M.Ş., İbrahimova R.Ş.** (2006) Abşeron və Xəzəryanı ərazilərdə tülkünün (Vulpis vulpis L.,1758) helmintlərinə təsir edən bəzi amillərin öyrənilməsi. AMEA Zoologiya İnstitutunun əsərləri. Bakı, Elm **XXXVIII:** 27.

**Асадов С.М., Исмаилов Г.Д.** (1972) Роль собак в кругообороте природно-очаговых гельминтов в Азербайджане. Докл.АН Азерб.ССР **ХХУШ(2):** 70-72.

**Бессонов А.С.** (1972) Эпизоотология (эпидемиология) и профилактика трихинеллеза. Изд-во Минтис, Вильнюс, 304.

**Галузо И.Г., Боев С.Н., Гвоздев Е.В.** (1968) Проблеме природной очаговости болезней сельскохозяйственных животных. В кн." Вопросы природной очаговости болезней". Алма-Ата: 6-14.

**Павловский Е.Н.** (1939) О природной очаговости инфекционных и паразитарных болезней «Вестник АН СССР», **10:** 98-108.

**Павловский Е.Н.** (1964) Природная очаговсть трансмиссивных болезней.М.,-Л. 207-215

**Павловский Е.Н.** (1964) Природная очаговость трансмиссивных болезней в связи с ландшафтной эпидемиологией зооантропонозов.М., 129-165.

**Садыхов И.А.** (1971) О мерах профилактики природно-очаговых гельминтозов человека в Азербайджане. Пробл. Мед. Географии Кузбасса. Мат. науч. конф., Новокузнецк: 69-71.

**Садыхов И.А.** (1978) Роль пушнопромысловых зверей в поддержании природных-очагов гельминтозов человека и сельскохозяйст-венных животных и других домашних животных в Азербайджане. Научн. и прикладн. пробл. Гельминтол. М., Наука: 89-94.

**Садыхов И.А.** (1981) Гельминты промысловых зверей Азербайджана. Баку, Элм: 167

**Садыхов И.А., Елчуев М.Ш.** (1985) Гельминты служебных собак Шеки-Закатальской зоны

Азербайджанской ССР. Извест. АН Аз. ССР, серия биол. наук **3**: 37-42.
**Скрябин К.И. (1928)** Методы полных гельминтологических вскрытий позвоночных, включая человека. Москва, МГУ: 45.

**Г.Г. Фаталиев, М.Ш. Елчуев, Р.Ш. Ибрагимова**

**Природно и Синантропные Очаговости Возбудителей Главнейших Гельминтозов Диких и Домашних Плотоядных Животных в Ширване**

Для выявления природной очаговости возбудителей главнейших гельминтозов из разных биотопов на территории Ширвана, были исследованы 24 бродячие собаки, 28 домашние кошки, 24 шакала, 26 лисиц методом полного гельминтологического вскрытия. У них найдено 34 вида гельминтов. Из них несколько видов являются природными и синантропными очагами: дипилидиоз, дирофиляриоз, трихинеллез, токсокароз, анкилостоматоз. Отмечена роль диких и домашних плотоядных животных, промежуточных хозяев, а также некоторые факторы в поддержании и распространении природной и синантропной очаговости на территории Ширвана. Подготовлены профилактические меры борьбы против появления новой природной очаговости.

**Q.Q. Fataliyev, M.Sh. Yolchiyev, R.Sh. Ibrahimova**

**Natural Sanitary Nidality of Activators of the Main Helminthiasis of the Wild and Domestic Carnivorous Animals in Shirvan**

Information about the role of wild and domestic carnivorous animals, intermediate hosts and some ecological factors in formation of naturalfocality of activators of the main helminthiasis in territory of Shirvan is presented in the paper. Some naturalfocalities (dipilidioz, dirofilyariosis, trichinelliosis, toxocarosis, ankilostomatosis) were found out as a result of reserarches in these territories. At the same time the reasons of maintenance of naturalfocalities are revealed and some control measures are presented.

*AMEA-nın Xəbərləri (biologiya elmləri), cild 66, №3, səh. 137-141 (2011)*

# Azərbaycanın Şirvan Coğrafi Zonasında Qoyun, Qaramal və Camışlarda Anoplosefalyatların və Onların Aralıq Sahiblərinin Yayılması

**Q.C. İsmayılov[1], E.V. Fərzəliyeva[2]**
[1]*Azərbaycan MEA Zoologiya İnstitutu*
[2]*Azərbaycan Dövlət Pedaqoji Universiteti*

**Müəlliflər ilk dəfə Şirvan coğrafi zonasında gövşəyən ev heyvanları arasında anoplosefalyatlar və onların aralıq sahiblərinin yayılmasını öyrənmişlər. Məlum olmuşdur ki, *Anoplocephalata* Skryabin 1933 (1951) yarımdəstəsi lentşəkilli qurdların böyük bir hissəsini özündə birləşdirmişdir ki, onların da yetkin forması gövşəyən heyvanların (qoyun, keçi, qaramal, camış, ceyran, cüyür, maral və s.) nazik bağırsağında, sürfə mərhələsi isə müxtəlif növ oribatid gənələrinin bədən boşluğunda yaşayaraq parazitlik edirlər. Gövşəyən heyvanlar kal vasitəsilə xarici mühitə (otlaqlara) ifraz etdikləri monieziya yumurtaları, oribatid gənələr tərəfindən udulduqda onlar yoluxurlar. Gənələrin bədən boşluğunda monieziya yumurtaları bir neçə mürəkkəb inkişaf mərhələsi keçirərək invazion serkosista mərhələsinə çatır. İnvazion serkosista sürfələri gənələrin bədən boşluğunda uzun müddət (gənələrin yaşama müddəti qədər) yaşayır və əlverişli şəraitdə (gənələr otla birlikdə udulduqda) axırıncı sahibləri yoluxdururlar. Göründüyü kimi axırıncı sahiblər aralıq sahiblərdən, aralıq sahiblər isə axırıncı sahiblərdən yoluxurlar. Məqalədə hər iki sahibdə anoplosefalyatların yetkin və sürfə mərhələlərinin yayılma dərəcəsi və yoluxma mexanizmi öyrənilmişdir.**

## GİRİŞ

Anoplosefalyatların sistematikası dünya alimləri tərəfindən uzun müddət müqayisəli surətdə öyrənilmişdir. Belə ki, 1902-ci ildə N.A. Xolodkovski *Anoplocephalidae* fəsiləsini yaratmışdır, həmin dövrə qədər bütün buğumlu sestodlar *Taeniidae* fəsiləsinə aid edilmişdir. Furman isə bu fəsiləni "*Anoplocephalidae* Furman, 1907" adlandırmışdı.

İspan helmintoloq alimi Mola (Mola, 1929) isə özünün şəxsi tədqiqatları əsasında bütün dünya alimlərinin tədqiqatlarını təftiş edərək özünün *Anoplocephalidae* fəsiləsini yaratmışdır. O, özünün müəlliflik səlahiyyətlərini saxlamaqla göstərir ki, *Anoplocephaloidae* fəsiləüstlüyü ilk dəfə 1891-ci ildə Blanşar (Blanchard, 1891) tərəfindən qeyd olunmuşdur (Спасский, 1951). Akademik A.A. Spasski (Спасский, 1951) isə *Anoplocephalata* Skryabin, 1933 yarımdəstəsinin *Anoplocephaloidea* Spassky, 1949 fəsiləüstlüyünü üç fəsiləyə bölmüşdür ki, bunlar da aşağıdakılardır:

1. *Anoplocephalidae* Cholodkowsky, 1902
2. *Avitellinidae* Spassky, 1950
3. *Linstowiidae* (Mola, 1929) Spassky, 1949

Bu bölgüdə *Anoplocephalidae* fəsiləsinə *M.expansa, M.benedeni* və *M.autumnalia*, *Avitellinidae* fəsiləsinə *Thysniezia giardi* və *Avitellina centripunctata* növləri daxildir ki, bunlar da əsasən gövşəyən heyvanlarda, *Linstowiidae* fəsiləsinin növləri isə kisəli məməlilərdə, bir çox gəmiricilərdə, yereşənlərdə (yersiçanı) və s. parazitlik edirlər (Спасский, 1951).

Azərbaycanda gövşəyən heyvanların helmint faunası son illərdə coğrafi-ekoloji helmintologiya təlimi əsasında öyrənilməyə başlanmışdır, bu isə respublikamızda helmint faunası üzrə aparılan tədqiqatlarda landşaft-ekoloji istiqamətin inkişafına səbəb olmuş, gövşəyən heyvanların helmint faunasının respublika ərazisində yayılmasında şaquli və üfüqi zonalılığın müəyyənləşdirilməsinə kömək etmiş və bu ərazilərin ekoloji-helmintoloji nöqteyi nəzərdən müəyyən zona və yarımzonaya bölünməsinə əsas vermişdir (Əsədov, 1975).

Beləliklə, akademik S.M. Əsədov (1975) uzun illər ərzində Azərbaycanda aparılan helmintoloji tədqiqatlar əsasında Azərbaycan ərazisini ekoloji-helmintoloji nöqteyi nəzərdən 3 zonaya və 11 yarımzonaya bölmüşdür.

Professor Y.F. Məlikov (Меликов, 1996) isə S.M. Əsədovdan fərqli olaraq Azərbaycan ərazisini üç deyil, dörd şaquli zonaya bölmüşdür.

Respublika ərazisində ekoloji-helmintoloji rayonlaşdırma apararkən hər bir zona və yarımzonanın müəyyən parametrləri uyğun gəlməlidir, belə ki, tədqiqat aparılan coğrafi zonada heyvanların əsas cəmləşdiyi yerlər, helmintozların geniş yayıldığı sahələr, təbii və məhəlli ocaqların formalaşdığı ərazilər, üfüqi və şaquli qurşaqlar, müxtəlif landşaftlar və biotoplar.

## MATERİAL VƏ METODLAR

Son üç ildə Şirvan coğrafi zonasında (Şamaxı, İsmayıllı, Ağdaş, Ağsu, Göyçay, Kürdəmir, Qobustan və s.) aparılan tədqiqatlar göstərmişdir ki, bu zonada bir sıra helmintlər, o cümlədən

anoplosefalyatlar gövşəyən ev heyvanları arasında geniş yayılmışdır, xüsusən dağ və dağətəyi Şirvanda. Bu zonada ev heyvanları arasında anoplosefalyatların yayılma dərəcəsini müəyyən etmək üçün, müxtəlif rayonlardan akademik K.İ.Skryabinin (Скрябин, 1928) tam helmintoloji yarma üsulu ilə 942 baş qoyun, 438 baş qaramal, 169 baş camış tədqiq edilmişdir. Monieziyaların aralıq sahiblərini müəyyən etmək üçün həmin zonanın qış və yay otlaqlarından (Ceyrankeçməz, Acıdərə, Qobustan, Padardüzü, Babadağ və s.) 200 torpaq nümunəsi götürərək onlardan oribatid gənələri Tulqrena aparatı vasitəsilə seçilərək E.M. Bulanova-Zaxvatkina (Буланова-Захваткина, 1952) üsulu ilə təyin olunmuşdur.

## NƏTİCƏLƏR VƏ ƏMƏLİ TƏKLİFLƏR

Şirvan coğrafi zonası (Şamaxı, İsmayıllı, Qobustan, Ağsu, Ağdaş, Göyçay, Kürdəmir, Hacıqabul və s.) başqa coğrafi zonalardan öz relyefinə, bitki örtüyünə və torpaq quruluşuna görə fərqlənir, burada yüksək dağ və dağətəyi zonalarla yanaşı, aran zona da mövcuddur. Bu zonanın aran hissəsi bir sıra ətraf rayonların (Quba, Qusar, Şabran, Siyəzən, Xaçmaz və s.) qoyunçuluq təsərrüfatları üçün qış otlaq yerləri hesab olunur. Şirvan zonası Böyük Qafqazın cənub-şərq ətəklərində yerləşərək qərb tərəfdən Girdmançayla, şərq tərəfdən isə Abşeron yarımadası ilə həmsərhəddir, bu zonanın ərazisindən Girdmançay, Ağsuçay və Pirsaat çayları axır. Burada əhali əsasən heyvandarlıq və taxılçılıqla, qismən də olsa tərəvəzçilik və bağçılıqla məşğul olurlar. Kolxoz və sovxoz quruluşunun dağılmasından sonra bu bölgədə müxtəlif səpkidə iri və xırda fermer təsərrüfatları yaradılmışdır. Fermer təsərrüfatlarının yaradılması ilə əlaqədar olaraq bölgədə heyvandarlığın inkişafı xüsusi bir vüsət almışdır. Belə ki, heyvandarlığın inkişafına dövlət qayğısı göstərilir, respublikaya dövlət səviyyəsində cins mal-qara növləri gətirilir, fermerlərə heyvandarlığı inkişaf etdirmək üçün güzəştli pul kreditləri və s. imtiyazlar verilir. Yeni fermer təsərrüfatlarının yaradılması ilə əlaqədar olaraq helmintoz xəstəliklərinə qarşı kompleks mübarizə tədbirləri də dəyişmiş, burada fərdi mübarizə tədbirlərinə üstünlük verilir. Bu da bir çox xəstəliklər kimi helmintoz xəstəliklərinə qarşı effektli metod hesab oluna bilməz. Ətkəsmə kombinatlarının, sallaqxanaların bağlanması ilə əlaqədar olaraq, satış üçün kənd təsərrüfatı heyvanları harada gəldi (yol kənarında, xüsusi həyətlərdə, hətta ət satılan mağazaların içində) kəsilir, bu da çox zaman baytar həkimin nəzarəti olmadan edilir.

Şirvan tədqiqat zonasında gövşəyən ev heyvanlarında anoplosefalyatlar və onların aralıq sahibləri bizim tədqiqata qədər demək olar ki, çox az öyrənilmişdir. Burada A.Q. Məmmədov (Мамедов, 1969) və Y.F. Məlikov (Меликов, 1996) apardıqları tədqiqat nəticəsində gövşəyən heyvanlarda anoplosefalyatların yayıldığı göstərilir. Monieziyaların aralıq sahibləri (oribatid gənələr) bizim tərəfimizdən ilk dəfədir ki, göstərilən zonada öyrənilir (Садыхов и др., 2008).

Göstərilən zonada heyvandarlığın intensiv inkişaf etdirilməsi ilə əlaqədar olaraq bir sıra helmintlərin, o cümlədən anoplosefalyatların geniş yayıldığı müşahidə edilir, xüsusən dağətəyi Şirvanda (Cədvəl 1).

Cədvəl 1-dən göründüyü kimi Şirvan zonasında anoplosefalyatlar ən çox qoyunlar arasında dağ və dağətəyi zonada (Şamaxı, İsmayıllı, Ağsu, Qobustan) nisbətən az isə aran rayonlarında (Kürdəmir, Göyçay, Ağdaş), qaramalda isə İsmayıllı və Qobustan rayonlarında daha çox yayılmışdır. Aparılan tədqiqatların nəticələri göstərmişdir ki, anoplosefalyat növlərindən *Moniezia expansa* və *M.benedeni* başqa növlərə nisbətən (*Avi. centripunctata və Thy. giardi*) qoyun və qaramal arasında bu bölgədə daha geniş yayılmışlar. Göstərilən zonada anoplosefalyatların camışlar arasında yayılması nisbətən az olmuşdur. Tədqiqatların nəticələri göstərmişdir ki, anoplosefalyatların kənd təsərrüfatı heyvanları arasında yayılmasında kəskin zonalılıq müşahidə edilmir, lakin başqa zonalarda olduğu kimi Şirvan zonasında da anoplosefalyatlar ev heyvanları arasında ən çox dağ və dağətəyi yerlərdə yayılmışlar.

Şirvan coğrafi zonasında gövşəyən heyvanın anoplosefalyatlarla yoluxmasında iki yüksələn xəttin olması müşahidə edilir, bu yazın axır iki ayı və payızın əvvəl və orta aylarında (Садыхов и др., 2008). Qeyd etmək lazımdır ki, ilin bu aylarında rütubətliliik çox olmaqla bərabər, örüşlər də göy otla örtülmüş olur ki ,bu da axırıncı sahiblərlə aralıq sahiblər arasında daha çox kontaktın yaranmasına səbəb olur. Şirvan coğrafi zonasınada qoyunların monieziozla yoluxmasının fəsildən asılı olaraq dəyişməsi qrafik şəkildə aşağıdakı kimi olur (Şək. 1).

Şirvan coğrafi zonasının qış və yay otlaqlarından (Ceyrankeçməz, Qobustan, Acıdərə, Padardüzü, Babadağın cənub ətək lərindəki yay otlaqlarından) və həmçinin Şamaxı, İsamayıllı yaylaqlarından və göstərilən rayonların cənub ərazilərindəki otlaqlardan 200 torpaq nümunəsi götürərək tədqiq edilmişdir. Tədqiq olunmuş torpaq nümunələrində 17 növ oribatid gənələri qeyd olunmuşdur (Cədvəl 2).

**Cədvəl 1.** Şirvan coğrafi zonasında gövşəyən ev heyvanlarında anoplosefalyatların yayılma dərəcəsi (tam helmintoloji yarmaya görə)

| Tədqiqat rayonları | Heyvan növü | Cəmi tədqiq edilmişdir | Yoluxmanın intensiv və ekstensivliyi | | | | |
|---|---|---|---|---|---|---|---|
| | | | *Moniezia expansa* | *Moniezia benedeni* | *Moniezia autumnalia* | *Thysaniezia giardi* | *Avitellina centripuncata* |
| **Şamaxı** | Qoyun | 210 | 31 (14,2%) /3-8 | 30 (14,2%) /2-5 | --- | 10 (4,7%) /2-4 | 25 (10,9%) /3-4 |
| | Qaramal | 170 | 12 (7,0%) /2-5 | 18 (10,5%) /3-8 | --- | 3 (1,7%) /1-2 | --- |
| | Camış | 84 | 10 (11,8%) /1-6 | 2 (2,3%) /1-2 | --- | 3 (3,5%) /1-2 | --- |
| **İsmayıllı** | Qoyun | 82 | 18 (21,9%) /1-12 | 20 (24,3%) /1-8 | --- | --- | 5 (6,09%) /1-3 |
| | Qaramal | 84 | 12 (14,2%) /1-4 | 6 (7,1%) /1-2 | --- | 5 (5,7%) /1-3 | 6 (7,1%) /1-3 |
| | Camış | 48 | 3 (6,2%) /1-2 | --- | --- | 3 (6,2%) /1-3 | --- |
| **Ağdaş** | Qoyun | 150 | 12 (8,6%) /2-4 | 10(11,1 %)/2-3 | --- | 15 (10,0%) /1-4 | 18 (12,0%) /1-2 |
| | Qaramal | 80 | 6 (7,5%) /1-3 | 8(10%) /1-2 | --- | 2 (2,5%) /1-1 | 3 (3,6%) /1-2 |
| | Camış | 37 | 2 (5,4%) /2 | --- | --- | 1 (2,7%) /3 | --- |
| **Qobustan** | Qoyun | 180 | 18 (10%) /2-4 | 25 (13,8%) /1-6 | --- | 10 (5,5%) /1-2 | 15 (8,3%) |
| | Qaramal | 60 | 10 (6,3%) /1-3 | 8 (13,3%) /1-2 | --- | 6 (10,6%) /2-4 | --- |
| **Göyçay** | Qoyun | 120 | 10 (8,3%) /1-2 | 10 (8,3%) /1-4 | --- | 5 (4,1%) /1-2 | 8 (6,6%) /2-3 |
| | Qaramal | 44 | 2 (4,5%) /2 | 3 (6,0%) /1-2 | --- | 3 (6,8%) /1-3 | --- |
| **Kürdəmir** | Qoyun | 200 | 20 (10,0%) /1-8 | 15 (7,5%) /1-5 | --- | 25 (8,0%) /2-4 | 30 (15,0%) /1-5 |
| **Cəmi** | Qoyun | 942 | 110(11,6%) | 110(11,6%) | --- | 65(6,9%) | 107(11,3%) |
| | Qaramal | 438 | 42 (9,5%) | 43(9,8%) | --- | 13(2,9%) | 9(2,5%) |
| | Camış | 169 | 10(4,05%) | 2(1,1%) | --- | 7(4,1%) | --- |




**Şək. 1.** Şirvan coğrafi zonasında qoyunların monieziozla yoluxmasının fəsildən asılı olaraq dəyişməsi.

**Cədvəl 2.** Şirvan zonasında monieziyaların aralıq sahibləri olan oribatid gənələrinin yayılması

| | Növlərin adı | Rayonlar | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|
| | | Şamaxı | İsmayıllı | Qobustan | Ağdaş | Göyçay | Kürdəmir | Ağsu | Hacıqabul |
| 1 | *Zygoribatula terricola* | + | + | + | + | + | + | + | + |
| 2 | *Z. microporos* | + | - | + | - | + | - | - | - |
| 3 | *Z. frisia* | + | + | + | + | + | + | + | + |
| 4 | *Z. cognata* | + | + | + | + | + | + | + | + |
| 5 | *Z. skryabini* | + | - | - | - | - | + | - | - |
| 6 | *Z. kelebedjarica* | + | + | - | - | - | - | - | - |
| 7 | *Z. rugosa* | + | - | + | + | + | + | - | - |
| 8 | *Scheloribates laevigatus* | + | + | + | + | + | + | + | + |
| 9 | *Sch. latipes* | + | + | + | + | + | + | + | + |
| 10 | *Sch. longiporosus* | + | - | + | + | - | + | - | - |
| 11 | *Sch. labrinthicus* | + | + | - | - | - | - | - | - |
| 12 | *Punctoribates punctum* | + | + | - | - | + | - | - | - |
| 13 | *Trichoribates nalchiki* | + | - | - | - | + | - | - | - |
| 14 | *Oribata peleptoides* | + | + | - | + | + | + | - | - |
| 15 | *O. expansa* | + | + | + | + | + | + | + | + |
| 16 | *Calumna nigra* | + | - | + | + | - | - | - | - |
| 17 | *Ceratoztes mediocris* | - | + | - | - | + | - | - | - |

Qeyd olunmuş oribatid gənələrdən *Zygoribatula terricola, Zyg. frisiae, Zyg. cognata, Scheloribates laevigatus, Sch. latipes, Oppia expansa* bütün tədqiqat rayonlarının otlaqlarında yayılmışdır və bu növlər monieziyaların epizootologiyasında başlıca mənbə hesdab olunurlar . Qeyd olunmuş 17 növ oribatid gənələrdən 10 növü monieziyaların aralıq sahibi rolunu oynayırlar. Başqa zonalarda olduğu kimi Şirvan zonasından da oribatid gənələri əsasən dağ və dağətəyi zonalarda daha geniş yayılmışlar Burada onların növ tərkibi müxtəlif olmaqla bərabər sayı da çox olur. Belə ki, burada daimi yaşıl ot və rütubətli hava şəraiti mövcuddur ki, bu da oribatid gənələrin yaşayıb çoxalması üçün ideal şərait hesab olunur. Şirvan zonasında oribatid gənələrinin intensiv inkişafında iki yüksələn xətt müşahidə olunur(aprel, may və bir də payızın axır aylarında). Acıdərə, Ceyrankeçməz, Padar və zonanın Göyçay, Ağsu, Ağdaş, Kürdəmir rayonları ərazilərində olan qış otlaqları yay aylarında invaziyadan demək olar ki, tam azad olurlar. Belə ki, yay aylarında bu otlaqlardan götürülmüş torpaq nümunələrində bir dənə də olsun oribatid gənəsi qeyd olunmamışdır. Yay aylarında oribatid gənələri torpağın dərin qatlarına miqrasiya edirlər, bu zaman torpağın üst qatlarında temperatura 38-40, bəzi yerlərdə isə 40-45$^0$S çatır. Məlum olduğu kimi oribatid gənələr saprofaq qidalanırlar, onlar torpağın dərin qatlarına miqrasiya edərkən orada çürüntü maddələri azalır, nəmlik isə çox aşağı düşür. Odur ki, torpağın dərin qatlarına miqrasiya edən oribatid gənələrinin çoxu orada məhv olur(rütubət və qida çatışmazlığından).

Kənd təsərrüfatı heyvanları arasında anoplosefalyatların yayılmasına qarşı mübarizə tədbirləri apararkən ilk növbədə mal-qara saxlanılan tövlə, dam ətrafında süni otlaqlar yaradılmalı, bura arpa, yonca və başqa çoxillik bitkilər əkilməlidir ki, ilk örüşlərə çıxarılan quzu, buzov və balaqlar bir müddət bu otlaqlarda otarıldıqdan sonra ümumi otlaqlara çıxarılsın. Təsərrüfatlarda mümkün qədər növbəli otlaqlar yaradılmalıdır. Helmintozlara qarşı aparılan mübarizə tədbirləri içərisində ən başlıcası heyvanların vaxtlı-vaxtında dehelmintizasi

ya edilməsidir, burada da yaşlı heyvanlar ildə dörd, cavan heyvanlar isə iki dəfə dehelmintizasiya edilməsi məsləhətdir.

## ƏDƏBİYYAT

**Blanchard R.** (1891) Sur les helminthes des primates antropoides. Mem. Soc. Zool. France **4:** 420-489.

**Əsədov S.M.** (1975) Azərbaycanda kənd təsərrüfatı heyvanlarının helmint və helmintozlarının zonalar üzrə yayılması və helmintozlarla mübarizənin gücləndirilməsi üçün təkliflər. Bakı: 86 s.

**Mola P.** (1929) Descriptio platodorum sine exstis. Zool. anz. **86:** 101-113.

**Буланова-Захваткина Е.М.** (1952) Экологические типы панцирных клещей и их распределение в почвах. Зоологический журнал **31(4):** 549-555.

**Мамедов А. К.** (1969) Эколого-географический анализ гельминтофаунистических комплексов крупного рогатого скота, буйволов, зебу и перспективы дальнейшей борьбы с гельминтозами этих животных в Азербайджане. Автореф. дис. на соиск. уч. степ. докт. биол. наук, Баку.

**Меликов Ю.Ф.** (1996) Гелминтозы овец Апшерон-Кобыстанской полупустынной зоны и Большого Кавказа Азербайджана. Из-во Бакинского Университета: 146 с.

**Садыхов И.А., Исмаилов Г.Д., Рзаев Н.М.** (2008) К распространению мониезиозов, парамфистоматозов сель-хоз. животных и их промежуточных хозяев в нагорном Ширване. Azərb. Zooloqlar cəmiyyətinin əsərləri, Bakı **I:** 176-179.

**Скрябин К.И.** (1928) Метод полных гельминтологических вскрытий позвоночных, включая человека.(ред. К.И. Скрябин), М.: 186 с.

**Спасский А.А.** (1951) Аноплоцефаляты ленточные гельминты домашних и диких животных. Основы цестодологии. М., Изд-во АНСССР **1:** 560 с.

**Г.Д. Исмаилов, Э.В. Фарзалиева**

**Распространение Аноплоцефалят у Овец, Крупного Рогатого Скота, Буйволов и Их Промежуточных Хозяев в Ширванской Географической Зоне Азербайджана**

Для выявления степени распространения аноплоцефалят и их промежуточных хозяев в данной зоне исследовано 942 голов овец, 438 голов крупнорогатого скота и 169 голов буйволов, а также 200 почвенных проб на летних и зимних пастбищах. Зараженность овец мониезиозами, соответственно, *M.expansa* и *M.benedeni* в данной зоне составляет 14,2-14,7%, тизаниозом, *Thy.giardi* - 4,7%, авителлинами *Avi. Centripunctata* - 10,9%. У крупного рогатого скота *M expansa* и *M.benedeni* - 9,5-9,8%, *Thy.giardi* - 2,9%, *Avi.centripunctata* - 2,5%. У буйволов *M.expansa* - 4,5%, *M.Benedeni* - 1,1%. *Thy giardi* - 4,1% *Avi. centripunctata* у буйволов не обнаружен. Распростронение аноплоцефалятоза у сельскохозяйственных животных в данном регионе чаще всего отмечается в предгорной зоне. Имеется два пика инвазии-овец (весна и осень). На летних и зимних пастбищах отмечено 17 видов орибатидных клещей, из них 10 видов являются промежуточными хозяевами мониезиоза.

**G.J. Ismayilov, E.V. Farzaliyeva**

**Prevalence of *Anoplocephaliata* in Sheep, Cattle, Buffalo and Their Intermediate Hosts in Shirvan Geographical Zone of Azerbaijan**

To reveal the degree of *Anoplocephaliata* and their intermediate hosts in this zone were examined 942 head of sheep, 438 head of cattle and 169 head of buffalo and 200 soil samples from summer and winter pastures. Prevalence of moniesioses, specifically, of *M.expansa* and *M.benedeni* in this zone is 14, 2 and 14,7%, respectively; thysaniosis, *Thy.giardi* - 4,7%; of avitellinosis, *Avi.centripunctata* - 10,9%. In cattle - *M.expansa* and *M.benedeni* 9,5 and 9,8%, respectively; *Thy.giardi* - 2,9%, *Avi.centripunctata* - 2,5%. In buffalo *M.expansa* - 4,5%, *M.benedeni* - 1,1%, *Thy.giardi* - 4,1% *Avi.centripunctata* were not revealed in buffalo. Prevalence of *Anoplocephaliata* infarm animals of this most often detected in the foothill zone. There are two peaks of invasion: late spring and autumn. In summer and winter pastures 17 species of oribatid mites were detected oh which 10 are intermediate hosts for moniesioses.

Dövrümüz elə bir texnoloji yeniliklərlə zəngindir ki, artıq köhnə üsullarla Aqrokimya elminin inkişafı da gündən-günə çətinləşir. Əsas çətinlik güclü informasiya axını ilə bağlıdır. Belə ki, mövcud informasiya axınının qəbul edilməsi, sistemləşdirilməsi, araşdırılması, saxlanılması, lazım olan vaxtda istifadə edilməsi, müqayisəli təhlili kimi məsələlər ən aktual məsələyə çevrilmişdir və artıq bütün bunları ənənəvi yollarla yerinə yetirmək mümkün deyildir. Yüksək tələblərə cavab verə bilən mükəmməl və dəqiq işlərin aparılması İnformasiya Sisteminin (İS) yaradılması ilə reallaşa bilər (Ismayılov, 2004). Torpağın münbitliyi üçün şərt təkcə torpağın qida elementləri və su ilə təmin olunması deyil, bu maddələrin bitki tərəfindən mənimsənilməsi üçün əlverişli ekaloji şəraitin olmasıda vacibdir (Məmmədov, 2004).

Müxtəlif torpaq iqlim şəraiti və müxtəlif aqrosenozlar altında torpaqların yeni-yeni ekaloji münbitlik modelləri yaranmaqdadır və informasiya axını güclənməkdədir.Odur ki, müasir elektron avadanlıqların bazasında torpaq-ekaloji mühitin informasiya bankının yaradılması həm elmi, həm də praktiki cəhətdən zəruridir (Məmmədov, 2004). Torpağın tərkibinə dair digər aqronomik məlumatlarla birlikdə qida elementlərinin idarə olunmasına dair məlumatların da çox sürətlə toplanılması və eynilə sürətli analiz olunub nəticələrinin istifadəçilərə çatdırılması olduqca vacibdir. Bütün bunların sadəcə bir texnoloji proses kimi yox tam şəkildə, bir sistemin tərkib hissəsi kimi yaradılmasına ehtiyac yaranmışdır. Belə bir sistemi elmi texniki yeniliklərin son nailiyyətlərini özündə birləşdirən coğrafi informasiya sistemlərinin platforması üzərində yaratmaq daha da yaxşı nəticələr verir. Belə ki, müəyyən bir sərhədlərə malik olan ərazidə fəaliyyətlərin yerinə yetirilməsində, optimal qərarların verilməsi üçün ehtiyac olan planlaşdırma, məlumat tərkibi, mühəndislik, tarixi, fiziki-kimyəvi və digər zəruri məlumatların etibarlı bir şəkildə analiz və idarə olunmasında CİS son texnologiyalara əsaslanan mükəmməl sistemdir.

Xəritə və xəritəçilik çox qədim anlayışlar olduğu bir halda, coğrafi informasiya sistemləri ən yaxın keçmişin insanlar tərəfindən yaradılmış və ətraf mühitə yenidən nəzər salmaq imkanlarına malik olan müasir texnologiyalar sistemidir.

CİS-texnologiyası əsasında işlənmiş xəritə materiallarında təqdim olunmuş bütün məlumatların vizual olaraq fəza coğrafi təhlilini, torpaq baza məlumatları və qiymətləri üzrə statistik araşdırmaları geniş əhatəetmə imkanlarına malik ola bilərik. Bütün bu imkanların geniş tətbiqi bu sistemin analoji informasiya sistemlərindən fərqli olmasını təmin edir, bir çox proqnozlaşdırma işlərində strateji planlaşdırma ətrafında üstünlüklərə və uyğunluğuna görə mütləq nəticələrin alınmasına şərait yaradır (www.ESRİ.com). Xəritələrin yaradılması və təhlili yeni bir istiqamət kimi qəbul edilmədiyi halda CİS-texnologiyası bu istiqaməti ən yeni bir məcraya yönəldir və bunun əsasında səmərəli, rahat, cəld və qısa müddətdə bir çox problemləri, məsələləri qlobal şəkildə həll etmək mümkün olur. Bütün təhlil və araşdırmalar avtomatlaşdırılır, insanların əvvəllər həll edə bilmədiyi bir sıra məsələ və problemlər səmərəli olaraq müasir vasitələrlə öz həllini tapır.

Bu məlumatlar coğrafi obyektlərlə, koordinatlarla əlaqəli olduqları üçün onların avtomatlaşdırılmış idarə edilməsi çox asandır. Onun köməyi ilə xəritədən istənilən torpaq parseli haqqında məlumatı çox cəld və çevik olaraq təyin etmək olar. Məsələn, hər hansı bir ünvanla bağlı təbii fəlakət, marşrut, təbii şərait, insan resursları, torpaqların keyfiyyəti, idarəetmə və s. proseslər üzrə müfəssəl şəkildə informasiyalar alınması CİS-in işləmə xüsusiyyətini bir daha sübut edən amillərə daxildir (Bayramov, 2009).

Müasir texnologiyanın inkişafı ilə əlaqədar olaraq tədqiqat metodları dəyişdirilmədən müasir elektron kadastr xəritələri əsasında Abşeron yarımadasında yayılmış bağ torpaqlarının hidroliz olunan azot, mütəhərrik fosfor və mübadilə olunan kaliumla təmin olunma kartoqramasının CİS-də hazırlanması müasir texnoloji inkişaf dövrü üçün çox əlverişlidir. Bağ torpaqlarının qida maddələri ilə təminolunma kartoqramlarının CİS-də tərtibinin yuxarıda sadalanan müsbət xüsusiyyətləri ilə yanaşı həm də bu elmi sahənin inkişafında yeni tədqiqat metodlarının tətbiqinə geniş imkanlar açır. Bu tədqiqat metodlarından ən başlıcası kosmik texnologiyaların tətbiqi ilə torpaqların bir çox keyfiyyət göstəricilərinin müəyyən olunmasıdır. Belə texnologiyaların tətbiqi nəticəsində əldə olunmuş geniş məlumatların emal olunması və istifadəçilərə çatdırılması kimi qlobal məsələlərin həllində bu sistem əvəzsiz rol oynayacaq. Bütün bu yenilikləri özündə birləşdirməklə sistemin müasir korporativ sistemlərə qoşulması da aqrokimya elminin inkişafına güclü təkan verə bilər.

Belə ki, texnoloji inkişaflar izlənilərək, yaxın gələcəkdə nə kimi dəyişiklərin olması da nəzərə alınmaqla, texniki səviyyədə də lazımlı infrastruktur qurulmalıdır. Yaradılmış kadastr xəritə laylarının, digər xəritə sektorlarınla məlumat






**Şək. 1.** Abşeron yarımadasında yayılmış bağ torpaqlarının qida maddələri ilə təmin olunması xəritəsi: çoxillik əkmələrin hidroliz olunan azotla təmin olunması üzrə (mq/kg-la).






**Şək. 2.** Abşeron yarımadasında yayılmış bağ torpaqlarının qida maddələri ilə təmin olunması xəritəsi: çoxillik əkmələrin fosforla təmin olunması üzrə (mq/kg-la).






**Şək. 3.** Abşeron yarımadasında yayılmış bağ torpaqlarının qida maddələri ilə təmin olunması xəritəsi: çoxillik əkmələrin mübadiləvi kaliumla təmin olunması üzrə (mq/kg-la).

mübadiləsini təmin etməklə və bir çox mətin məlumatları ilə də əlaqələr qurula bilər. Xəritə laylarında aqrokimyaya aid bölmənin olması bu elmi sahənin öyrənilməsində və praktikaya tətbiqində sıçrayışlı inkişafı təmin edə bilər.

Abşeron bağ torpaqlarının aqrokimyəvi tədqiqatlarının nəticələrinə uyğun hidroliz olunan azot (Şək. 1), mütəhərrik fosfor (Şək. 2) və mübadilə olunan kaliumla (Şək. 3) təmin olunma kartoqramasının nümunəsi müasir coğrafi informasiya sistemində hazırlanmışdır. Bu metodika üzrə texnologiyaların müasir kənd təsərrüfatının kimyalaşdırılması sahəsində tətbiqinin genişləndirilməsinə, fərdi təsərrüfatların elmi tədqiqata cəlb olunmasına, aqrokimyəvi tədqiqat sistemlərinin dünya standartlarına inteqrasiyasına şərait yaratmış olacaqdır. Müasir texnologiya əsasında tərtib olunmuş xəritə fərdi və fermer təsərrüfatı torpaqlarının münbitlik göstəricilərinin geniş tərkibdə izlənilməsinə, müqayisəli təhlillərin aparılmasına imkan yaradır. Kiçik sahələr üzrə torpağın tərkibi haqqında detallı analiz məlumatlarının belə toplanması bu müasir texnologiyanın tətbiqi olmadan mümkün deyil. Bu texnologiya çöl müşahidələrinə uyğun olaraq aqrokimyəvi monitorinqlərin aparılmasına, müxtəlif mövzularda çöl hesabatlarının, bu sahə üzrə digər sənədlərin tərtib olunmasına da şərait yaradır.

Elektron aqrokimya xəritələrin tərtib edilməsi üçün ayrı-ayrı bağ sərhədlərindən torpaq nümunələri götürülərkən, nümunələrin götürüldüyü yerin vahid dünya koordinat sistemində dəqiq koordinatları GPS vasitəsi ilə təyin olunmuşdur. Laboratoriya analizinin nəticələri torpaq parsellərinə uyğun olaraq cədvəllərdə yığılmışdır. Proqram təminatının köməyi ilə qida elementlərinin miqdarına uyğun olaraq parsellər müxtəlif rənglərə boyanması və avtomatik xəritələşdirilməsi təmin olunur.

Dövrü olaraq torpaq sahəsinin laboratoriya analizlərinin nəticələrinə uyğun elektron xəritənin yenilənməsi heç bir vaxt itirmədən yerinə yetirilir. Yeni tədqiqat müddətini gözləmədən torpaq sahələrində aparılmış aqrotexniki tədbirlərə uyğun qida maddələrinin miqdarında baş verən dəyişikliklərə dair məlumatlar sistemə daxil edilə bilər. Bu torpaqda gedən prosesləri çevik izləməyə optimal şərait yaradır. Elektron xəritədən ayrı-ayrı torpaq sahəsi və ya bağ massivi üzrə qida elementləri ilə təmin olunma və digər aqrokimyəvi göstəricilərə dair çıxarışların verilməsi mümkündür. Torpaq sahəsinin aqrokimyəvi xarakteristikasına dair çıxarış qida elementlərinin miqdarı haqqında göstəricilər və yerləşdiyi məkanın xəritəsi ilə birlikdə məqalədə verilmiş nümunəyə uyğun avtomatik olaraq çap oluna bilər.

## NƏTİCƏLƏR

CİS-texnologiyalarının imkanlarından istifadə etməklə torpaqların qida maddələri ilə təminolunma vəziyyətinə dair tərtib olunan elektron xəritə və məlumat sistemi bağ torpaqlarından başqa kiçik və iri fermer təsərrüfatlarında da becərilən bitkilərin məhsuldarlığının planlaşdırılmasında, onun monitorinq prosesində tam yeni və geniş səviyyədə qərarların qəbul edilməsinə yaxşı şərait yarada bilər. Bu kənd təsərrüfatı məhsulları istehsalçıları ilə digər qurumlar arasında məlumat mübadiləsini dünya standartlarına uyğun problemsiz həllinə imkan yaratmaqla yanaşı həm də aqrokimyəvi xidmətin modernləşdirilməsinə xidmət edəcəkdir.

Aparılmış aqrokimyəvi tədqiqatlar nəticəsində bağ torpaqlarının mülkiyyətçilərinə və eləcədə digər kənd təsərrüfatı təyinatlı torpaq mülkiyyətçilərinə aqrokimya xidmət təşkilatları tərəfindən torpaqların qida maddələri ilə təmin olunma kartoqramı, gübrələrdən səmərəli istifadə edilməsi və torpaq münbitliyinin artırılması haqqında tövsiyələri özündə əks etdirən hesabat və kartoqrama aid izahat kimi məlumatların verilməsi eyni zamanda bu məlumatların internet vasitəsi ilə ötürülməsi də yaxın gələcəkdə əkinçilik sisteminin reallıqları olacaqdır.

## ƏDƏBİYYAT

**Babayev M.P., Cəfərova Ç., Həsənov V.** (2006) Azərbaycan torpaqlarının müasir təsnifatı. Bakı, Elm: 5.

**Bayramov R.V.** (2009) Xəritəçilik və Cografi İnformasiya Sistemləri. Azərbaycan Respublikası Təhsil Nazirliyi Bakı Dövlət Universiteti Cografiya Cəmiyyətinin BDU filialının əsərləri: 42.

**Cəfərov M.İ.** (1982) Torpaqşünaslıq. Bakı, Maarif: 219-220.

**Ismayılov A.I.** (2004) Azərbaycan torpaqlarının informasiya sistemi. Bakı, Elm: 7.

**Məmmədov Q.Ş., Yaqubov Q.Ş.** (2002) Azərbaycan Respublikasının torpaqlarının iri miqyaslı tədqiqi və xəritələşdirilməsinə aid təlimat. Bakı, Maarif: 109.

**Məmmədov Q.Ş.** (2004) Azərbaycanın Ekoetik Problemləri: elmi, hüquqi, mənəvi aspektlər. Bakı, Elm: 116-180.

**Torpaqların münbitliyi haqqında Azərbaycan Respublikasının Qanunu** (30 dekabr 1999-cu il N 788-IQ) (2007) Torpaq Qanunvericiliyi Bakı Qanun: 170.

**S.Kh. Shukurov**

**Composition of the Agrochemical Cartograms of the Garden Soils Spread in the Peninsula of Absheron on the Basis of the Temporary Technology**

The new perspectives of the application of temporary technologies are shown in the solution of these temporary problems of the agrochemistry science. As a result of the application of CIS technologies on the basis of the last development level of the cartography the samples of the cartograms of the composed nutrient of the on Absheron peninsula garden strips soils on the basis of this technology have been presented by grounding of the composition of the agrochemical cartograms.

**С.Х. Шукюров**

**Составление на Основе Современной Технологии Агрохимических Картограмм Садовых Почв Распространенных на Абшеронском Полуострове**

В статье приведены современные проблемы агрохимической науки и уровень развития современной технологии для решения этих проблем. В результате внедрения CIS технологий на основе уровня развития картографии, основываясь на применении агрохимических картограмм, были представлены образцы картограмм изученных питательных элементов в садовых почвах Абшерона.

*AMEA-nın Xəbərləri (biologiya elmləri), cild 66, №3, səh.159-163 (2011)*

# Bəzi Georgin Gül Sortlarının Bioloji Xüsusiyyətlərinin Öyrənilməsi və Кompozisiyaların Tərtibatında İstifadəsi

**T.S.Məmmədov, Ş.A.Gülməmmədova***
*AMEA Mərdəkan Dendrarisi*

**Məqalədə bəzi georgin sortlarının bioloji xüsusiyyətləri, fenologiyası, öyrənilmə tarixi, aqrotexnikası haqqında məlumat verilərək onların müxtəlif formalı kompozisiyaların tərtibatında istifadə olunması tövsiyə olunmuşdur.**

***Açar sözlər:*** *kompozisiya, introduksiya, fenologiya, georgin*

## GİRİŞ

Gülçülük - yaşayış yerlərinin yaşıllaşdırılması və dekorativ tərtibatının əsas tərkib hissələrindən biridir. Çiçəklər bağları, parkları, xiyabanları, küçələri bəzəyir, otaqların tərtibatında istifadə edilir. Son dövrlərdə Bakı şəhərinin abadlaşdırılmasında yeni birillik, ikiillik, çoxillik, soğanaqlı və kök yumrulu dekorativ ot bitkilərindən geniş istifadə olunur ki, bu da şəhərin landşaft memarlığı üslubunda yaşıllaşdırılmasında özünün aktuallığını göstərir. Parkların, bağların və küçələrin yaşıllaşdırılmasında müxtəlif kompozisiyalar yaratmaq üçün ağac və kol bitkiləri ilə yanaşı dekorativ ot bitkilərindən də istifadə olunmasının böyük əhəmiyyəti vardır. Keçmiş illərin bir çox dekorativ gül tərtibatları müasir şəhərlərin və evlərin yeni tikintilərinə, formalarına uyğun gəlmir, ona görə landşaft memarlığı üslubunda yeni kompozisiyalar yaradılmalı, küçə və parkları bəzəməlidir. Tərtib edilən kompozisiyalar yerli şəraitə uyğun olaraq, milli formada tərtib edilməlidir. Bu baxımdan hal-hazırda Abşeronun yaşıllaşdırılmasında istifadə olunan dekorativ bitkilərin yeni növlərlə zənginləşməsinə ehtiyac vardır.

## MATERİAL VƏ METODLAR

Georgin *(Dahlia* Cav.*)* cinsi rus botanik alimi və etnoqrafı İ.Georginin şərəfinə adlandırılmışdır. Cinsə 27 növ daxildir və onların vətəni Mərkəzi Amerika və Kolumbiyadır. Gülçülükdə georginlərin 4 növündən və müxtəlif mədəni formalarından istifadə olunur. Yerüstü hissələri hər il məhv olur. Çiçəyi səbət çiçək qrupuna aiddir (Məmmədov, 2006).

Uzun müddət Mərkəzi Amerikada yaşamış ispan həkimi Fransisko Xernandes 1551-ci ildə ilk dəfə georginləri təsvir etmiş və şəkillərini çəkmişdir. İndiyə qədər bu şəkillər Vatikanın kitabxanasında saxlanılır. Botaniki ədəbiyyatda georginlər haqqında ilk məlumatlar 1790-cı ildə Madrid Botanika Bağının bitkilərinin təsvirində *«Dahlia»* adı ilə verilmişdir və artıq 1802-ci ildən onlar çox məşhur olmuşlar. 1784-cü ildə ispan səyahətçisi Sosino georginlərin kök yumrularını Meksikadan Madridə gətirmişdir. XVIII əsrdə georgin Avropa ölkələrinə yayılmışdır. Georginlərin bütün sortları mədəni georgin (*Dahlia cultorum* Thorsr. et Reis.) növünə birləşdirilmişdir. Bunlar çox fazalı, növarası və sortarası çarpazlaşmalar nəticəsində alınmış hibridlərdir. Hazırda bütün dünyada seleksiyaçılar tərəfindən georginlərin 15 min sortu alınmışdır (Савельева, 2005).

Georginlərin bütün sortları 3 qrupa bölünür: 1) ağacşəkilii; 2) alçaqboy; 3) lələkvari və çəhrayı. Birinci qrupa ağacşəkilli georgin, imperiya georgini və digərləri aiddir. Saplaqların hündürlüyü 1,5-dən 6m-dək, yarımoduncağabənzər, qışlayandır. Vegetasiya dövrü uzunmüddətlidir. Çiçək qrupları sadə və çoxləçəkli, diametri 8-dən 14 sm-dək, bir çalarlı və ya alabəzək rənglidir. Georginlərin ikinci qrupuna alçaqboy sortlar aiddir, məsələn Merka georgini. Merka georgini – uzunluğu 60 sm-ə çatan, möhkəm çiçək saplaqlarında xırda, sadə çiçək qrupları yerləşən alçaqboy bitkidir. Çiçək qrupları kolun üzərində yuxarıda yerləşir. Bu sort tez çiçəkləməsi ilə fərqlənir və cırtdan georginlərin əcdadı hesab edilir. Üçüncü qrupa aid olan lələkvari və çəhrayı georginlər çox miqdarda çoxləçəkli, şarşəkilli, bir çalarlı, alabəzək rəngli georgin sortları vermişlər. XIX əsrin ortalarında bu sortların miqdarı 3000 qədər çatmışdır. Lələkvari və çəhrayı georginlərin çiçək qrupları çiçəklərinin rənginə görə çox müxtəlifdir (Заливский, 1956).

Georginin yeraltı orqanı kök yumruludur. Gövdəsi çox kövrəkdir və tez sınır. Gövdəsinin hündürlüyü 30 sm-dən 2 m-ə qədər olur. Yarpaqları iri olub, uzunluğu 7-30 sm, eni 5-25 sm-

E-mail: shalala.g@mail.ru

dir. Çiçəkləri əsas və yan budaqların ucunda yerləşmişdir. Georgini kök yumrularını bölməklə, qələmlə və toxumla çoxaltmaq olur (İbadlı və b., 2003).

AMEA Mərdəkan Dendrarisində georgin (*Dahlia* Cav.) cinsinin mədəni georgin (*Dahlia cultorum* Thorsr. et Reis.) növünün 2 sortu (*D.«Tilly», D.«Sedovzy»)* ilk dəfə olaraq becərilmiş, bioloji xüsusiyyətləri öyrənilmiş və kompozisiyaların tərtibatında istifadə edilmişdir (Şəkil 1, 2).



**Şəkil 1.** *D.«Tilly»* **sortu**




**Şəkil 2.** *D.«Sedovzy»* **sortu**

Mərdəkan Dendrarisində aparılmış tədqiqat işində cücərtilərin, ilk yarpaqların və vegetativ orqanların morfoloji xüsusiyyətləri İ.T.Vasilçenkonun (1979) və İ.Q.Serebryakovun (1952) metodikaları ilə öyrənilmişdir. Bitkilərin böyümə dinamikasını təyin etmək üçün vegetasiya başlanandan qurtarana kimi hər 10 gündən bir müşahidə aparılmışdır. Bitkilər üzərində fenoloji müşahidələr aparmaq məqsədilə N.A.Avrorinin (1953), A.Q.Qolovaçın (1962), F.N.Rusanovun (1970) və Rusiya Baş Botanika Bağının işləyib hazırladıqları metodikalardan istifadə olunmuşdur. Fenospektrlərin qurulmasında İ.N.Beydemanın (1979) metodikasından istifadə edilmişdir. Kök sisteminin morfologiyası öyrənilərkən V.A.Kolesnikovun (1971) «köklərin tam çıxarılaraq yuyulması» metodikasından istifadə edilmiş, vegetasiyanın sonunda kök yumruları qazılmış, torpaqdan çıxarılmış, onların sayı, uzunluğu, eni, kök boğazının diametri və quruluşu müəyyənləşdirilmişdir. Bitkilərin istiliyə davamlılığı K.A.Axmatov (1972), R.Moles (1992), L.Mucina (1993), quraqlığa davamlılığı isə P.A.Qenkelin (1956) metodikaları ilə öyrənilmişdir.

Mərdəkan Dendrarisində aparılmış tədqiqat işində georgin (*Dahlia* Cav.) cinsinin mədəni georgin (*Dahlia cultorum* Thorsr. et Reis.) növünün 2 sortundan (*D.«Tilly», D.«Sedovzy»)* 20 kök yumrusu mart ayının III ongünlüyündə açıq sahədə torpaq hazırlanaraq ləklərə əkilmişdir. Kök yumrularının arasındakı məsafə 18 sm qoyulmuş, əkilmə dərinliyi 10-14 sm olmuşdur. Kök yumrularının uzunluğu 6-15 sm, eni – orta hissəsi 3,5-4,5 sm, uc hissəsi 1-1,5 sm, əsas kökün uzunluğu 9 - 11 sm, qalınlığı 0,2 - 0,5 sm, yan köklərin sayı 4 - 9 ədəd, yan köklərin uzunluğu 10 -12,5 sm, qalınlığı 0,1 - 0,2 sm olmuşdur. Aprel ayının II ongünlüyündə *D.«Tilly»* və *D.«Sedovzy»* sortlarının 19 kök yumrusunun cücərtisi görünməyə başlamış və 95% təşkil etmişdir. *D.«Tilly»* və *D.«Sedovzy»* sortlarını öyrənərkən məlum olmuşdur ki, bitkilərin yerüstü hissəsində əsas inkişaf dövrü aprel ayının II ongünlüyündən başlayır və dekabr ayının I ongünlüyünədək davam etmişdir. Tədqiqatlar nəticəsində məlum olmuşdur ki, *D.«Tilly»* sortunun hündürlüyü vətənində olduğu kimi 100 sm, *D.«Sedovzy»* sortunun hündürlüyü isə vətənindən fərqli olaraq Abşeron şəraitində 10 sm alçaq olmuşdur. Vegetasiya müddəti 238-241 gün davam etmişdir. Georgin sortlarından əkilmiş 20 ədəd kök yumrusundan bala kök yumruları ilə birlikdə torpaqdan 37 ədəd kök yumrusu çıxarılmışdır.

Georginlər açıq, günəşli, küləkdən qorunan sahələrdə yaxşı bitir. Ən yaxşı torpaq-çürüntülərlə zəngin gillicə və ya yaxşı gübrələnmiş qumluca torpaqdır. Payız bellənməsindən əvvəl 1 kv. m. sahəyə 8-10 kq peyin və ya kompost verilir. Əgər torpaq turşdursa 1 kv. m sahəyə 300-500 q əhəng vermək lazımdır. Gillicə torpaqlara qum və torf, qumluca torpaqlara isə torf və gil əlavə edilir. Sonra torpaq 30-40 sm dərinlikdə bellənir və bu halda qışa qədər saxlanılır. Yazda əkinə bir-iki həftə qalmış torpaq yenidən bellənir və georginlərin əkin yerləri qeydə alınır.

Georgin sortlarının yarpaqlarının morfoloji göstəriciləri, hündürlüyü və böyümə müddəti göstərilmişdir (Cədvəl 1,2,3).

Georgin (*Dahlia* Cav.) cinsinin mədəni georgin (*Dahlia cultorum* Thorsr. et Reis.) növünün 2 sortu (*D.«Tilly», D.«Sedovzy»)* üzərində aparılmış fenoloji müşahidələr nəticəsində məlum

**Cədvəl 1**. Georgin sortlarının tam formalaşmış yarpaqlarının morfoloji göstəriciləri (sm)

| № | Sortların adları | Yarpaqların sayı (əd.) | Uzun. | Eni | Forması | Rəngi |
|---|---|---|---|---|---|---|
| 1 | *D.«Tilly»* | 44-46 | 5-8 | 3-7 | Yumru | Tünd yaşıl |
| 2 | *D.«Sedovzy»* | 30-35 | 6-9 | 4-7 | --- | --- |

**Cədvəl 2.** Abşeron şəraitində 3 il ərzində tədqiq olunan georgin sortlarının hündürlüyü (sm)

| № | Sortların adları | 2004 | 2005 | 2006 |
|---|---|---|---|---|
| 1 | *D. «Tilly»* | 84-88 | 81-85 | 83-87 |
| 2 | *D. «Sedovzy»* | 88-90 | 94-100 | 91-95 |

**Cədvəl 3**. Mərdəkan dendrarisində öyrənilən sortların böyümə müddəti (sm)

| № | Sortların adları | Böyümənin tarixi Baş. | Qurt. | Böyümənin davam etdiyi) müddət (gün |
|---|---|---|---|---|
| 1 | *D.«Tilly»* | 11.IV± 3 | 15.VII± 2 | 94± 2 |
| 2 | *D.«Sedovzy»* | 13.IV± 2 | 12.VII± 2 | 89± 2 |

olmuşdur ki, Abşeron şəraitində cücərtilərin alınması aprel ayının II ongünlüyündə, yarpaqların açılması aprel ayının III ongünlüyündə, qönçələmə iyul ayının II ongünlüyündə, çiçəyin açılmağa başlaması iyul ayının III ongünlüyündə, çiçəklmənin qurtarması noyabr ayının I ongünlüyündə müşahidə olunmuşdur. Bir bitkinin çiçəkləmə müddəti 8-9 gün davam etmişdir. Dekabr ayının I ongünlüyündə yarpaqlar saralmağa başlamış və dekabr ayının II ongünlüyündə bitkinin yerüstü hissəsi tamamilə qurumuşdur. Mərdəkan Dendrarisində georginin 2 sortunun çiçəkləmə biologiyası öyrənilmişdir. Sortların fenoloji inkişaf fazaları üzərində aparılan müşahidələr göstərmişdir ki, çiçəkləmənin davam etmə müddəti ən çox *D.«Tilly»* (9 gün), sonra isə *D.«Sedovzy»* (8 gün) sortunda müşahidə edilmişdir.

Georginlərin cırtdan və tünd yarpaqlı sortları əsasən kütləvi, iri çiçəkli sortları isə tək və qrup əkinlərində istifadə edilir. Eyvanlarda tez və bol çiçəkləyən alçaqboy sortları əkilir. Dəstə bağlamaq üçün uzun və möhkəm saplaqları olan, tez və bol çiçəkləyən sortları becərilir. Hal-hazırda cırtdan georginlərin kütləvi əkinləri yaşıllaşdırmada geniş yayılmışdır. Georginlər dəstə bağlamaq üçün çox istifadə edilir. Kəsilmiş halda şarşəkilli sortları və M.F.Şaronovanın yeni payızgülüşəkilli sortları digər sortlara nisbətən öz dekorativliyini saxlayır (Иванов və b.,1969).



**Şəkil 3.** Georginin kök sistemi

*Dahlia* Cav. – georginin müxtəlif sortlarının kök sistemi çox miqdarda ehtiyat qida maddələri toplayan köklərdən (kök yumrularından) ibarətdir (Şəkil 3).

Georgin sortlarının köklərinin morfoloji göstəriciləri cədvəl 4-də verilmişdir.

**Cədvəl 4**. Öyrənilən georgin sortlarının kök sistemi (sm)

| № | Sortların adları | Köklərin sayı | Kökün forması | Uzunluğu | Qalınlığı |
|---|---|---|---|---|---|
| 1 | *D.«Tilly»* | əsas-1 | mil kök | əsas-14 | əsas 0,8 |
| | | yan 7-12 | | yan-9 | yan 0,1-0,2 |
| 2 | *D.«Sedovzy»* | əsas-1 | mil kök | əsas-12 | əsas-0,7 |
| | | yan-8 | | yan 6-9 | yan 0,1-0,3 |

**Cədvəl 5**. Tədqiq olunan georgin sortlarının fenoloji inkişaf fazaları

| № | Sortların adları | Cücərtilərin alınması | Yarpaqlama | Qönçələmə | Çiçəkləmə Baş. | Qur. | Yarpaqların saralması | Yerüstü hissənin quruması |
|---|---|---|---|---|---|---|---|---|
| 1 | *D. «Tilly»* | 11.IV± 3 | 22.IV± 2 | 15.VII± 2 | 23.VII±2 | 4.XI± 3 | 3.XII± 3 | 12.XII±2 |
| 2 | *D.«Sedovzy»* | 13.IV± 2 | 24.IV± 3 | 12.VII± 2 | 20.VII±3 | 6.XI± 2 | 6.XII± 2 | 11.XII± 3 |

Tədqiqat işində dekabr ayının II ongünlüyündə georgin sortlarının yerüstü hissəsi quruduqdan sonra kök boğazından 10-15 sm yuxarıdan kəsilmiş, torpaqdan bala kök yumruları ilə birlikdə 37 ədəd kök yumruları çıxarılaraq təmizlənmiş, qurudulmuş və üstünə qum töküb 4-8$^0$C temperaturda, sərin zirzəmidə saxlanılmışdır.

Georgin sortlarının fenoloji inkişaf fazaları cədvəl 5-də verilmişdir.

Parkların, xiyabanların, bağların tərtibatında georginlərdən geniş istifadə olunur. Formalarının və çiçək qruplarının müxtəlifliyinə görə georginlər çox orijinaldır. Onları böyük massivlərdə, qrup və tək əkinlərdə, çiçək ləklərində əkmək olar. Onlardan dəstə bağlamaq üçün də istifadə edilir (Нечаева, 1962).

## NƏTİCƏ

Mərdəkan Dendrarisinin «Landşaft memarlığı» laboratoriyasında georgin cinsinin (*Dahlia* Cav.) mədəni georgin (*Dahlia cultorum* Thorsr. et Reis.) növünün 2 sortu (*D.«Tilly», D.«Sedovzy»)* üzərində aparılmış tədqiqatlar nəticəsində məlum olmuşdur ki, bu sortlar Abşeron şəraitində yaxşı inkişaf edir, yerli mühitə, torpaq-iqlim şəraitinə uyğunlaşır və regionun yaşıllaşdırılması, müxtəlif formalı kompozisiyalar düzəltmək üçün dəyərli bitkisidir.

## ƏDƏBİYYAT


**İbadlı O.V.,Ağamirov Ü.M.,Bayramov A.Ə. (**2003) Gülçülük. Bakı, Ozan Nəşriyyatı: 85 s.

**Məmmədov T.S.** (2006) Gülçülük ensiklopediyası. Bakı, Azərb. Nəşriyyatı: 231 s.

**Аврорин Н.А.** (1953) Акклиматизация и фенология. Бюлл. ГБС АН СССР (Москва), **16:** 8-11

**Ахматов К.А.** (1972) Полевой метод определения жароустойчивости растений. Бюлл. ГБС АН СССР (Москва), **86:** 73-74.

**Бейдеман И.Н.** (1979) Методика изучения фенологии растений и растительных сообществ. Новосибирск, Наука: 155 с.

**Васильченко И.Т.** (1979) Определитель всходов сорных растений. Ленинград, Колос: 181-182.

**Генкель П.А.** (1956) Диагностика засухоустойчивости культурных растений и способы её повышения. Методические указания. Москва, АН СССР: 69 с.

**Головач А.Г.** (1962) Декоративные и другие полезные растения в природе и культуре. М.-Л, АН СССР: 39-98.

**Заливский И.Л.** (1956) Георгины. М.- Л., Государственное Издательство Сельскохозяйственной литературы: 115, 122.

**Иванов П.Н., Голубкова А.Д., Зайцева Е.Н., Евтюхова Е.А.** (1969) Цветы на шей родины. М., Колос: 106-107.

**Колесников В.А.** (1971) Методы изучения корневой системы древесных растений. М., Лесная промышленность: 152 с.

**Нечаева Н.Т.** (1962) Декоративные растения для озеленения Туркмении. Ашхабад, АН Туркменской ССР: 172 с.

**Русанов Ф.Н**. (1970) Вопросы, разрешаемые при изучении интродуцированных растений. Академия Наук Узбекской ССР. Ботанический Сад. «Интродукция и акклиматизация растений». Ташкент, ФАН, **7:** 187-194.

**Савельева Г.А. (**2005) Георгины. М., Кладезь-Букс: 5, 7, 14.

**Серябряков И.Г.** (1952) Морфология вегетативных органов высших растений. М., Советская наука: 293 с.

**Moles R.** (1992) Trampling damage to vegetation and soil cover at patwithin Burren National Park, Mullach mor, Co Clare. Irish Geogr., **25 (2):** 129.

**Mucina L.,Grabherr G.,Ellmauer T.** (1993) Die Pflanzen gesell schaften Oster reichs. Teil Jena, G.F.V. **55:** 490.

**Т.С. Мамедов, Ш.А. Гюльмамедова**

**Изучение Биологических Особенностей Некоторых Сортов Георгина и Их Использование при Создании Композиций**

В статье даются сведения о биологических особенностях, фенологии, истории изучения и агротехнике некоторых сортов георгина и рекомендовано их использование при создании различных форм композиций.

**T.S. Mammadov, Sh.A. Gulmammadova**

**Study of Biological Features of Some of the *Dahlia* Cav. Varieties and Their Use in Creating Compositions**

The data on biological features, phenology, studying history, agrotechnology of some *Dahlia* Cav. varieties are given in the paper and the use is recommended in different forms of compositions.

AMEA-nın Xəbərləri (biologiya elmləri), cild 66, №3, səh. 164-168 (2011)

# Enterovirus İnfeksiyası Olan Hamilə Qadınlarda Hematoloji və Biokimyəvi Göstəricilər

**N.F. Heydərova**
*Bakı şəhəri, 1 saylı qadın məsləhətxanası*

## GİRİŞ

Hamiləliyin adəti pozulması müasir ginekologiyada ən mürəkkəb problemlərdən biri sayılır. Bu xəstəliyin müalicəsi olduqca çətindir, çünki hamiləliyin normal gedişinə mane olan səbəbi əksər hallarda dəqiq müəyyən etmək mümkün deyildir. Bütün qadınların 1%-i bu problemlə qarşılaşır. Bu rəqəm təsadüfi paylanma zamanı gözləniləndən yüksəkdir, çünki klinik təsdiqlənmiş hamiləlik hallarının təqribən hamısının 10-15-%-i hamiləliyin pozulması ilə başa çatır və təsadüfi paylanma zamanı 3 ardıcıl düşüklərin nəzəri riski 0,34% təşkil edir (Cowan, 2001).

Hamiləliyin vaxtındanəvvəl pozulmasının səbəblərinin strukturunda infeksion amilin rolu tam aydın deyildir. İnfeksion agentin məhz adəti pozulmaların «səbəbi kimi» qəbul edilməsi üçün o, qadının cinsiyyət yolunda heç bir əlamət vermədən və ya minimal simptomlarla təzahür edərək persistensiya qabiliyyətinə malik olmalıdır (Kiüak, 2004; Başmakova i Popova, 2007). Tamamilə aydındır ki, hamiləlik zamanı enterovirus infeksiyaları ilə (EVİ) xəstələnmə (ümumilikdə populyasiyada olduğu kimi), xüsusilə də xəstələnmənin epidemik alovlanmaları dövründə kifayət qədər yüksəkdir. Bundan başqa, persistensiya edən EVİ hamiləliyin adəti pozulmalarına, fetoplasentar çatmamazlığın inkişafına və dölün bətndaxili yoluxmasına təkan verir (Huang et al., 1999; Amvrosğeva, 2001).

Tədqiqatın məqsədi plasentar çatmamazlığın erkən diaqnostikasının klinik-laborator meyarlarının aşkar edilməsi məqsədilə enterovirus infeksiyaları olan qadınlar qrupunda hamiləliyin dinamikasında hematoloji və biokimyəvi göstəricilərin öyrənilməsi olmuşdur.

## MATERİAL VƏ METODLAR

Bütün laborator müayinələr adəti hamiləlik pozulmaları (AHP) və enterovirus infeksiyaları (EVİ) olan 108 hamilə qadında dinamikada müalicədən əvvəl və müalicə müddətində aparılmışdır. Kontrol qrupu AHP ilə, lakin EVİ olmayan 50 pasiyent təşkil etmişdir. Hamilə qadınlarda laborator göstəricilərdən aşağı-dakılar təyin olunmuşdur: hemoqlobinin miqdarı, eritrositlərin sayı, eritrositlərin ümumi həcmi (hematokrit göstəricisi); trombositlərin sayı, protrombin əmsalı, fibrinogen, trombosit-lərin kollagenlə birgə aqreqasiyası, antitrombombin III, plazmanın rekalsifikasiyasının aktivləşmə müddəti (RAM).

Lipidlərin peroksidləşməsi məhsullarının müəyyən edilməsi: malon dialdehidi V.B. Qavrilov və M.İ. Mişkorudinə görə (Qavrilov, 1983); dien konyuqatları (modifikasiya ilə) (Yagi et al., 1968; Yagi et al., 1976); α-tokoferol - fluorimetriya metodu ilə (Taylor et al., 1976); qan zərdabının antioksidləşdirmə aktivliyinin - yumurta sarısı lipoproteidləri tətbiq etməklə (Klebanov i dr., 1988). Materialın statistik işlənməsi fərdi kompüterdə Microsoft office Excel 2007 proqramında yerinə yetirilmişdir.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Plasentar çatmamazlığın erkən diaqnostikasının klinik-laborator meyarlarının aşkar edilməsi məqsədilə biz enterovirus infeksiyaları olan qadınlar qrupunda hamiləliyin dinamikasında hematoloji və biokimyəvi göstəriciləri öyrənilmişdir. Müəyyən edilmişdir ki, ağırlaşmış hamiləlik zamanı 8-12-ci həftəsindən hemoqlobinin səviyyəsi artmaqla hemokonsentrasiya nəzərə çarpmışdır. Bu vahid qan həcmində eritrositlərin (oksigen daşıyıcılarının) sayının artması üçün kompensator reaksiya kimi qəbul edilmişdir (Cədvəl 1).

Fəsadlaşmış hamiləlik zamanı hemostaz sisteminin öyrənilməsi trombositlərin sayının 8-12 həftədə $283,7\times10^9$/l-dən 35-39 həftəsində $239,9\times10^9$/l-dək azalmasını ($p<0,001$); fibrinogenin konsentrasiyasının hamiləliyin sonuna doğru I trimestrlə müqayisədə 36,1%-ə qədər artmasını ($p<0,001$); plazmanın rekalsifikasiyasının aktivləşmə müddətinin (RAM) doğuşa qədər 26%-qədər qısalmasını ($p<0,001$); hamiləliyin sonuna doğru trombositlərin aqreqasiyasının 19%-ə qədər artmasını ($p<0,05$) aşkar etdi. Hemostaz sisteminin göstəricilərinin dəyişikləri fetoplasentar kompleksin normal formalaşması və doğuş zamanı qanaxmaların azalması üçün onun əhəmiyyət daşıdığını bir daha göstərir. Yüksək risk qrupunda hemostaz sisteminə dair məlumatlar Cədvəl 2-də verilmişdir.

Biz fəsadlaşmış hamiləliyin dinamikasında III antitrombinin proqressiv şəkildə azalmasını aşkar etmişik. RAM isə qanın laxtalanma sisteminin bütün amillərinin və trombositlərin 3-cü amilinin aktivliyini müəyyən edən göstərici olaraq fəsadlaşmış hamiləliyin sonuna doğru xeyli azalmış, hestasiyanın 28-ci həftəsində isə bu, daha intensiv baş vermişdir. Beləliklə, EVİ olan qadınlar qrupunda hemostazda antikoaqulyasiya amillərinin çatışmazlığının dərinləşməsi və trombəmələgəlmə riskinin artması istiqamətində dəyişikliklər meydana çıxmışdır.

**Cədvəl 1.** Müayinə olunan qadınlar qrupunda periferik qanın bəzi göstəriciləri

| Göstəricilər | Hamiləliyin müddəti | | | |
|---|---|---|---|---|
| | 8 -12 həftə | 13-20 həftə | 28-33 həftə | 35-39 həftə |
| | EVİ olan hamilə qadınlar (n=108) | | | |
| 1 mkl qanda eritrositlərin sayı | 3,98±0,14<br>$p<0,01$ | 3,74±0,09<br>$p_1<0,05$ | 3,71±0,06<br>$p_1<0,001$ | 3,74±0,06<br>$p_1<0,001$ |
| Hemoqlobinin miqdarı, q/l | 125,73±1,47 | 118,02±1,25<br>$p_1<0,001$ | 119,91±1,34<br>$p<0,001$; $p_1<0,001$ | 121,84±1,46<br>$p_1<0,05$ |
| Hematokrit göstəricisi, l/l | 0,390±0,056 | 0,370±0,005<br>$p_1<0,05$ | 0,370±0,007<br>$p_1<0,001$ | 0,370±0,004<br>$p<0,001$; $p_1<0,01$ |
| | Kontrol qrupu ( n=50) | | | |
| 1 mkl qanda eritrositlərin sayı | 3,98±0,14<br>$p<0,01$ | 3,74±0,09<br>$p_1<0,05$ | 3,71±0,06<br>$p_1<0,001$ | 3,74±0,06<br>$p_1<0,001$ |
| Hemoqlobinin miqdarı, q/l | 125,73±1,47 | 118,02±1,25<br>$p_1<0,001$ | 119,91±1,34<br>$p<0,001$; $p_1<0,001$ | 121,84±1,46<br>$p_1<0,05$ |
| Hematokrit göstəricisi, l/l | 0,390±0,056 | 0,370±0,005<br>$p_1<0,05$ | 0,370±0,007<br>$p_1<0,001$ | 0,370±0,004<br>$p<0,001$; $p_1<0,01$ |

**Cədvəl 2.** Müayinə olunan qadınlar qrupunda hamiləlik zamanı hemostaz sisteminin göstəriciləri

| Göstəricilər | Hamiləliyin müddəti | | | |
|---|---|---|---|---|
| | 8 -12 həftə | 13-20 həftə | 28-33 həftə | 35-39 həftə |
| | EVİ olan hamilə qadınlar (n=108) | | | |
| Trombositlər, $10^9$/l | 283,7±7,41<br>$p< 0,05$ | 255,2±7,22<br>$p< 0,01$ | 236,1±6,87<br>$p< 0,001$ | 239,9±6,09<br>$p< 0,001$ |
| Protrombin əmsalı, % | 90,2±2,55 | 91,2±1,61<br>$p< 0,001$ | 96,6±1,32<br>$p< 0,05$ | 95,6±0,98<br>$p< 0,001$ |
| Fibrinogen, q/l | 3,6±0,34<br>$p< 0,01$ | 3,5±0,14<br>$p< 0,1$ | 4,1±0,13<br>$p< 0,001$ | 3,9±0,15<br>$p< 0,001$ |
| RAM, s | 63,9±0,91 | 56,5±1,9<br>$p< 0,001$ | 49,9±1,72<br>$p< 0,001$ | 46,9±0,91<br>$p< 0,001$ |
| Trombositlərin kollagenə aqreqasiyası, % | 37,5±0,40<br>$p< 0,05$ | 42,5±0,67<br>$p< 0,001$ | 47,5±1,59<br>$p< 0,001$ | 48,9±1,19<br>$p< 0,05$ |
| Antitrombin III, q/l | 0,21±0,005 | 0,18±0,02<br>$p< 0,05$ | 0,12±0,03<br>$p< 0,05$ | 0,12±0,04<br>$p< 0,001$ |
| | Kontrol qrupu (n=50) | | | |
| Trombositlər, $10^9$/l | 283,7±7,41<br>$p< 0,05$ | 255,2±7,22<br>$p< 0,01$ | 236,1±6,87<br>$p< 0,001$ | 239,9±6,09<br>$p< 0,001$ |
| Protrombin əmsalı, % | 90,2±2,55 | 91,2±1,61<br>$p< 0,001$ | 96,6±1,32<br>$p< 0,05$ | 95,6±0,98<br>$p< 0,001$ |
| Fibrinogen, q/l | 3,6±0,34<br>$p< 0,01$ | 3,5±0,14<br>$p< 0,1$ | 4,1±0,13<br>$p< 0,001$ | 3,9±0,15<br>$p< 0,001$ |
| RAM, s | 63,9±0,91 | 56,5±1,9<br>$p< 0,001$ | 49,9±1,72<br>$p< 0,001$ | 46,9±0,91<br>$p< 0,001$ |
| Trombositlərin kollagenə aqreqasiyası, % | 37,5±0,40<br>$p< 0,05$ | 42,5±0,67<br>$p< 0,001$ | 47,5±1,59<br>$p< 0,001$ | 48,9±1,19<br>$p< 0,05$ |
| Antitrombin III, q/l | 0,21±0,005 | 0,18±0,02<br>$p< 0,05$ | 0,12±0,03<br>$p< 0,05$ | 0,12±0,04<br>$p< 0,001$ |

*Cədvəl 3.* EVİ olan qadınların qan zərdabında dien konyuqatlarının, malon dialdehidinin və α-tokoferolun antioksidant aktivliyinin (AOA) miqdarının dəyişməsi

| Hamiləlik müddəti, həftə | AOA şərti vahid. | DK mkmol/l | MDA mkmol/l | α-tokoferol mmol/l |
|---|---|---|---|---|
| | | Kontrol qrupu (n=50) | | |
| 8 - 15 | 10,9±0,46 | 2,1±0,11 | 0,91±0,01 | 9,1±0,42 |
| 16 - 24<br>p | 8,9±0,36<br><0,01 | 2,0±0,16 | 0,89±0,02 | 7,8±0,98<br><0,01 |
| 28 - 34<br>p | 7,7±0,72<br><0,001 | 2,4±0,12<br><0,001 | 1,1±0,02<br><0,01 | 6,6±0,47<br><0,001 |
| 35 – 40<br>p | 9,4±0,56<br><0,001 | 3,9±0,24<br><0,001 | 1,1±0,03<br><0,001 | 7,6±0,78<br><0,01 |
| doğuşdan sonra<br>p | 8,0±0,38 | 2,0±0,18 | 1,0±0,02<br><0,001 | 6,2±0,98<br><0,001 |
| | | EVİ olan pasiyentlər (n=108) | | |
| 8 - 15 | 12,0±0,98 | 1,2±0,14 | 0,90±0,01 | 10,2±1,12 |
| 16 - 24<br>p | 6,1±0,36<br><0,001 | 2,0±0,22<br><0,001 | 1,20±0,01<br><0,001 | 6,8±0,96<br><0,001 |
| 28 - 34<br>p | 6,4±0,48 | 3,4±0,26<br><0,001 | 1,22±0,02<br><0,001 | 6,2±0,78<br><0,001 |
| 35 - 40<br>p | 6,9±0,26 | 3,9±0,12<br><0,001 | 1,23±0,04<br><0,001 | 5,8±0,96<br><0,001 |
| doğuşdan sonra<br>p | 6,6±0,90 | 3,6±0,24<br><0,001 | 0,89±0,01<br><0,001 | 4,4±0,78<br><0,001 |

Qeyd: p – 8-15 həftə ilə müqayisədə göstəricilərin fərqlərinin dürüstlüyü

Mikrodamarların endotelisinin yayılmış zədələnməsi və trombositlərin kontakt aktivləşməsi qadının orqanizmində lipidlərin peroksidləşməsi (LPO) prosesinin intensivliyinin güclənməsi, qanda bəzi digər agentlərin artması ilə bağlıdır. LPO prosesləri universal xarakter daşıyaraq orqanizmdə biokimyəvi dəyişikliklərin davamlılıq göstəricisi sayılır və orqanizmin adaptasiya imkanlarına təsir edir və patoloji proseslərin inkişaf ehtimalını müəyyən edir (Qaylonskaə, 2006). Biz kontrol qrupdakı şəxslərdə fəsadlaşmamış hamiləlik zamanı dien konyuqatlarının (DK) doğuşdan əvvəl birinci trimestrlə müqayisədə artdığını aşkar etmişik (2,1±0,11-dən 3,9±0,24 mkmol/l-ə qədər). Malon dialdehidi (MDA) isə bütün hamiləlik ərzində praktik olaraq dəyişməmişdir (Cədvəl 3).

Hamiləliyin sonuna doğru antioksidant aktivlik (AOA) 10,9±0,46-dən 9,4±0,56 ş.v.-ə qədər və α-tokoferol 9,1±0,42-dən 7,6±0,18 mmol/l-ə qədər azalmışdır. Bu, ona gətirib çıxarmışdır ki, LPO prosesləri normal maddələr mübadiləsini təmin edən səviyyədə baş vermişdir. Cədvəl 3-də EVİ olan qadınlar qrupunda hamiləlik zamanı LPO sistemində dəyişikliklərin xarakteri haqqında məlumatlar təqdim olunmuşdur. Bu məlumatlar təsdiq edir ki, plasentar çatmamazlıq zamanı LPO proseslərinin aktivliyi fazalı xarakter daşıyır və hipotrofiyanın ağırlıq dərəcəsindən asılı olaraq intensivliyinə görə fərqlənir. Normadan daha böyük fərqlər EVİ zamanı təyin edilmişdir. LPO-nun aktivləşməsi α-tokoferolun və qanın ümumi AOA-nın aşağı səviyyəsi ilə müşayiət olunmuşdur ki, bu da antioksidant müdafiə (AOM) bufer həcminin azaldığından xəbər verir. AOM sistemində ən böyük gərginlik hamiləlik zamanı EVİ olan pasiyentlərdə müşahidə olunmuşdur. EVİ zamanı AOA əvvəldə yüksək olmuş (12,0±0,98 ş.v.) və hamiləliyin 8-15-ci həftəsində α-tokoferolun (10,2±1,12 mmol/l) bir qədər yüksəlməsi ilə kompensasiya olunmamışdır. Bu, hamiləliyin AOM sisteminin zəifləməsi fonunda sürdüyünü göstərir. Hamiləliyin 34-35-ci həftəsinədək pro- və antioksidantlar sistemində praktik olaraq əvvəllər mövcud olan bütün korrelyasiya əlaqələrinin yenidənqurulması baş vermişdir. EVİ zamanı AOA əlaqələri zəif təzahür etmişdir, hamiləliyin 8-15-ci həftəsində bu göstəricinin 12,0±0,98 ş.v.-dən hamiləliyin 35-40-cı həftəsində 6,9±0,26 ş.v.-ə qədər kəskin azalması baş vermişdir ki, bu da AOM sisteminin gücünün zəiflədiyini və LPO-AOA proseslərində lipidlərin peroksidləşməsi istiqamətində tarazlığın dəyişildiyini təsdiq edir.

## ƏDƏBİYYAT

**Амвросьева Т.В.** (2001) Современное состояние проблемы энтеровирусных инфек-ций человека. Медицина **2:** 39-41.

**Гайлонская И.Н.** (2006) Кишечные вирусы и вызываемые ими заболевания. М., Медицина: 146 с.

**Башмакова М.А., Попова Н.А.** (2007) О внутриутробной вирусной инфекции. Вопр. охр. мат. **6:** 37-38.

**Кицак В.Я.** (2004) Вирусные инфекции беременных: патология плода и новорожденных. Кольцово, ЗАО «Вектор-Бест»: 22-57.

**Гаврилов В.Б.** (1983) Спектрофотометрическое определение содержания гидроперекисей липидов в плазме крови (под ред. В.Б. Гаврилова, М.И. Мишкорудной) Лаб. дело **3:** 33-35.

**Клебанов Г.И., Бабенкова И.В., Теселкин Ю.О. и др.** (1988) Оценка антиокислительной активности плазмы крови с применением желточных липопротеинов. Лаб. дело **5:** 59-62.

**Cowan F.M.** (2001) Developing preventative strategies in Europe. Int. J. Epidemiol. **30(6):** 588-589.

**Huang C.C., Liu C.C., Chang Y.C. et al.** (1999) Neurologic complications in children with enterovirus 71 infection. N. Engl. J. Med. **341(13):** 936-942.

**Taylor S.L., Lamden M.P., Tappel A.L.** (1976) Sensitive fluorometric method for tissue tocopherol analysis. Lipids **11:** 530-538.

**Yagi K., Ozawa T., Naoi M., Kotaki A.** (1968) Flavins and Flavoproteins (Yagi K., ed.). University of Tokyo Press, Tokyo: 237p.

**Yagi K.** (1976) A simple fluorometric assay for lipoperoxide in blood plasma. Biochem. Res. **15:** 212-216.

**Н.Ф. Гейдарова**

**Гематологические и Биохимические Показатели у Беременных с Энтеровирусными Инфекциями**

С целью выявления клинико-лабораторных критериев ранней диагностики плацентарной недостаточности нами проведено изучение гематологических и биохимических показателей в динамике беременности в группе женщин с энтеровирусными инфекциями. Установлено, что при осложненной беременности с 8-12 недель имелась гемоконцентрация с увеличением уровня гемоглобина. Изучение системы гемостаза при осложненной беременности выявило снижение числа тромбоцитов с $283{,}7\times10^9$/л в срок 8-12 недель до $239{,}9\times10^9$/л в срок 35-39 недель; увеличение концентрации фибриногена на 36,1% к концу беременности по сравнению с I триместром; укорочение активированного времени рекальцификации плазмы к сроку родов на 26%; увеличение агрегации тромбоцитов на 19% к концу беременности. Изменения показателей системы гемостаза подчеркивают её значение для нормального формирования фетоплацентарного комплекса и ограничения кровопотери в родах. В группе женщин с энтеровирусными инфекциями возникли изменения гемостаза в направлении усугубления дефицита факторов антикоагуляции и увеличения риска тромбообразования. Полученные данные о характере изменений в системе ПОЛ при беременности в группе женщин с ЭВИ, свидетельствуют о том, что при плацентарной недостаточности активность процессов ПОЛ имеет фазный характер и отличается по интенсивности в зависимости от степени тяжести гипотрофии. Наиболее существенные отклонения от нормы установлены при ЭВИ. Активация ПОЛ сопровождалась низким уровнем $\alpha$-токоферола и общей АОА крови, что указывало на снижение буферной емкости антиоксидантной защиты (АОЗ). Наибольшее напряжение в системе АОЗ наблюдалось при беременности у пациенток с ЭВИ. При ЭВИ уровень АОА был изначально высоким (12,0±0,98 усл.ед) и не компенсировался некоторым повышением $\alpha$-токоферола (10,2±1,12 ммоль/л) в 8-15 нед. беременности. Это указывает на наступление беременности на фоне истощения системы АОЗ.

**N.F. Gejdarova**

**Hematology and Biochemical Indicators at Pregnant Women with Enterovirus Infections**

For the purpose of revealing of clinic-laboratory criteria of early diagnostics of placentary insufficiency the hematology and biochemical indicators in dynamics of pregnancy in group of women with enterovirus infections were studied. It was established, that at the complicated pregnancy from 8-12 weeks there was a hemoconcentration with increase in level of hemoglobin. Studying of system of a hemeostasis at the complicated pregnancy has revealed number of the decrease in trombosytes from $283{,}7\times10^9$/l during 8-12 weeks to $239{,}9\times10^9$/l during 35-39 weeks; the concentration increase in fibrinogen by 36,1% at the end of pregnancy in comparison with I trimester; shortening of activated plasma recalcification time during childbirth by 26%; the increase in trombosytes aggregation by 19% at the end of pregnancy. Changes of indicators of homeostasis system underline its value for normal fetoplasentar formation depending on a complex and restriction of blood loss during childbirth. In group of women with enterovirus infections, there were changes of a hemostasis in a direction of aggravation of anticoagulation factors deficiency and the risk of a blood clot formation increase. The obtained data about character of changes in system the lipid peroxide oxidation at pregnancy in group of women with enterovirus infection, testify that at placentary insufficiency activity of processes of the lipid peroxide oxidation posses phase character and differs on intensity depending on severity level of hypotrophy. The most essential deviations from normal state were established during enterovirus infection. Activation of the lipid peroxide oxidation was accompanied by low level of α-tocopherol and general blood antioxidant activity that specified in decrease in buffer capacity of antioxidant protection. The greatest pressure in the antioxidant protection system was observed during pregnancy at patients with enterovirus infection. During infection level of antioxidant activity was initially high ($12{,}0\pm0{,}98$ st.units) and was not compensated by some increase in α-tocopherol ($10{,}2\pm1{,}12$ mmol/l) during 8-15 week of pregnancy. It specifies in approach of pregnancy during exhaustion of antioxidant protection system.

*AMEA-nın Xəbərləri (biologiya elmləri), cild 66, №3, səh. 169-172 (2011)*

# "FAYDALI BİTKİLƏRDƏN İSTİFADƏNİN AKTUAL PROBLEMLƏRİ" mövzusunda BEYNƏLXALQ KONFRANS

**Bakı, Azərbaycan**
**26-28 oktyabr 2011-ci il**

Məlum olduğu kimi, Azərbaycanın bitki aləmi çox zəngindir. Bu qədim diyarda 4700-dən çox ali sporlu və çiçəkli bitki növü məlumdur ki, onun 240 növü endemiklərdir. Bundan başqa Respublika ərazisində 865-dən artıq şibyə növü vardır. Azərbaycanın yabanı florasında 460-a yaxın ağac və kol bitkilərinə təsadüf olunur və onların 70-i endemik növ olub, respublikamızdan kənarda bitmir. Azərbaycan torpağında üçüncü dövrə aid olan (qədim) relikt ağac və kollara da rast gəlinir. Onlardan eldar şamı, dəmirağac, ipək akasiyası, xəzər lələyi və başqalarını göstərmək olar. Azərbaycan florasına dərman, efir-yağlı, dekorativ, qida, texniki və digər faydalı bitkilər xammal mənbəyi kimi baxmaq olar. İnsanlar öz fəaliyyətləri ilə birbaşa və ya dolayı yolla təbii bitki örtüyünə təsir edir və nəticədə əsirlər boyu yaranmış təbii ekosistemləri dəyişdirir. Hal-hazırda insan öz iqtisadi və təsərrüfat fəaliyyətini gücləndirmək üçün ətraf mühitə sürətlə müdaxilə edir. Müasir dövrdə biomüxtəlifliyin genetik fondunu qoruyub saxlamaq vacib məsələlərdən biri hesab olunur. Ona görə də təbiətin bəxş etdiyi bu zənginliyi qorumaq, ondan səmərəli istifadə etmək dövlətimizin və onun hər bir vətəndaşının borcudur.

Bu gün dünyada baş verən böhran hər 6 nəfərdən birinin gün ərzində bir dəfə qidalanmasına və ya ac yatmasına gətirib çıxarmışdır. Bu problemin aradan qaldırılması üçün dünya alimləri florada yayılan dərman, tərəvəz, ətirli-ədviyyəli bitkilərin müasir səviyyədə öyrənilməsinə başlamışdırlar, onların istifadəsinə dair yeni təkliflər hazırlanır və ölkələrdə bu problemin həllinə müəyyən qədər kömək edə biləcək elmi seminarlar, treyninqlər və konfranslar keçirilməkdədir. Bu istiqamətdə görüləcək kütləvi işlər öz aktuallığı ilə alimlərin maraq dairəsindədir.



Azərbaycan Respublikasının elminin və iqtisadiyyatının inkişaf etdirilməsi üçün onun təbii sərvətlərindən olan faydalı bitkilərin elmi əsaslarla araşdırılması, səmərəli və yeni istifadə imkanlarının ortaya çıxarılması da bu problemin tərkib hissəsidir. Ətraf mühitdən qida əhəmiyyəti və xalq təbabətində ənənvi istifadə olunan növlərin seçilməsinin yeni istiqamətləri, vacib olan resursların bioloji və ekoloji xüsusiyyətlərinin müəyyənləşdirilməsi, ayrı-ayrı fərdlərin ontogenezi, həmçinin onların populyasiya strukturunun və həyati formalarının dinamikasının tədqiqi, faydalı resursların təbii ehtiyatları, onların biokimyəvi tərkibi və molekulyar səviyyədə öyrənilməsi sayəsində botanika elmini müasir səviyyədə inkişaf etdirmək olar.

Bunun üçün dünya təcrübəsindən yararlanaraq, gənc botanik, əczaçı, fitoterapevt və ekoloqları təkminləşdirmək tələb olunur. Eyni zamanda təbii sərvətlərin qorunması və düzgün istifadəsi də problemin məqsədlərindən biridir. Təbii sərvətlər içərisində faydalı bitkilərin resursları xüsusi yer tutur. Bioresursların tərkib hissəsi kimi bitkilər aləmi - insanların əsas ehtiyaclarını təmin edən ümümxalq sərvətidir. İnsanlar bu sərvətlərdən bacarıqla istifadə etməli, onların qorunması və məhsuldarlığının daim artırılması üçün nəzəri və əməli təkliflər işləyib hazırlamalıdır.

Bu mənada akademik Cəlal Əliyevin tövsiyyəsi və fəxri sədrliyi ilə 26-28 oktyabr 2011-ci il tarixində AMEA Botanika İnstitutunda keçirilən "Faydalı bitkilərdən istifadənin aktual problemləri" mövzusunda beynəlxalq konfrans çox əhəmiyyətli olmuşdur. Beynəlxalq konfransda iştirak etmək üçün 35- dən artıq ölkədən alimlər elmi işləri ilə müraciət etmiş, 25 ölkənin nümayəndəsi bilavasitə ölkəmizə təşrif gətirmişdir. Konfransın işində Rusiya, Norveç, Portuqaliya, Ukrayna, Türkiyə, Gürcüstan və başqa ölkələrin alimləri ilə yanaşı, AMEA-nın müvafiq elmi-tədqiqat institutlarının, dərman bitkiləri ilə və ya birbaşa bitki mənşəli preparatlarla müalicə işi aparan klinikaların, o cümlədən qida məhsulları hazırlayan şirkətlərin nümayəndələri də iştirak etmişlər. Konfransda aşağıdakı istiqamətlərdə çıxışlar edilmiş və geniş diskusiyalar aparılmışdır:

- Faydalı bitkilərin öyrənilməsi və səmərəli istifadəsi;
- Xalq təbabəti və etnobotanika;
- Dərman, aromatik və qida bitkilərinin biokimyası, biotexnologiyası və bioloji fəal maddələrin alınması;
- Qeyri ənənəvi müalicə, aromaterapiya, fitoterapiya və fitopreparatlar;
- Qida bitkilərinin stres amillərə qarşı davamlılığının mexanizmləri;
- Genetik ehtiyatların və ətraf mühitin qorunmasının texnoloji aspektləri;
- İntroduksiya və faydalı bitkilərin becərilməsinin sənaye əhəmiyyəti.







Beynəlxalq konfransı giriş sözü ilə açan Azərbaycan Respublikası Dövlət Torpaq və Xəritəçəkmə Komitəsinin sədri, akademik Qərib Məmmədov qonaqları salamladı, konfransın keçirilməsinin önəmliyini qeyd etdi. Son zamanlar AMEA Botanika İnstitutunun beynəlxalq əlaqələrini genişləndirdiyini söyləyən Q.Məmmədov bu münasibətlərin daha da inkişaf etdirilməsinin vacibliyi, elmi və mədəni əlaqələrin inkişafının zəruriliyindən söz açdı, konfransın işinə uğurlar arzuladı.

Sonra konfransın həmsədri, Botanika İnstitutunun direktoru biologiya elmləri doktoru Validə Əlizadə "AMEA Botanika İnstitutunun tədqiqat fəaliyyəti: istiqamətlər, yanaşmalar və perspektivlər" mövzusunda məruzə ilə çıxış etdi. O,

institutun yaranma tarixi, institutun əsas elmi istiqamətləri, elmi nailiyyət, yenilik və perspektivləri haqqında ətraflı məlumat verdi. İnstitutda aparılan elmi-tədqiqat işlərinin müasir dövrün tələblərinə uyğunlaşdırılaraq daha da inkişaf etdirildiyini söyləyən V.Əlizadə beynəlxalq elmi əməkdaşlıq münasibətləri, ölkələrimiz arasındakı elmi əlaqələr və bu əlaqələrin gələcək inkişafından söz açdı.

Konfransın digər həmsədri, Botanika İnstitutunun "Etnobotanika" laboratoriyasının müdiri, biologiya elmləri doktoru Səyyarə İbadullayeva "Azərbaycanın flora və bitkiliyi: faydalı bitkilərin istifadəsinin ekoprotektiv təsiri" mövzusunda geniş məruzə ilə çıxış etdi.

Konfransın açılış günü eyni zamanda Ali Osman Sari (Türkiyə, Tarımsal Araşdırmalar və Politikalar İnstitutu) "Türkiyədə istifadə olunan dərman bitkilərinin etnobotaniki tətbiqi", Ana Maria Barata (Portuqaliya, Tərəvəzçilik İnstitutu) "Dərman və aromatik bitkilər üzrə ECPGR işçi qrupu: koordinasiya və əməkdaşlıq" mövzusunda məruzələrlə çıxış ediblər.

Oktyabrın 27-də konfrans çoxsaylı məruzəçilərin iştirakı ilə öz işini davam etdirmişdir.

Məruzələr ətrafında geniş müzakirələr aparılmış, verilən suallar cavablandırılmışdır. Gələcəkdə də belə konfransların keçirilməsini vacibliyi göstərilmişdir.

Oktyabrın 29-da konfransın bağlanışı olmuşdur. Konfrans iştirakçıları AMEA-nın biologiya profilli insitutularında olmuş, Gobustan Dövlət Qoruğuna ekskursiyaya getmiş, Bakının görməli yerləri ilə tanış olmuşlar. Qonaqlar Azərbaycanı böyük ruh yüksəkliyi ilə tərk etmişlər.

Konfransın materialları kitabça şəklində çap olunmuşdur.

Sevindirici haldır ki, konfransın əsas məqamlarını Avropada Bitki genetik ehtiyatlarının qorunması üzrə fəaliyyət göstərən ECPGR, Türkiyə Tarım Bakanlığı Tarım Araşdırma İnstitutu və I Moskva Tibb Universiteti öz saytlarında yerləşdirmişlər.